**SABİR RÜSTƏMXANLI**

OĞUZ XAN BOYUNU SÖYLƏR

# GÖY TANRI

**BAKI — 2005**

**Az2**

Redaktor: **Eldar Quliyev**
Rəssam: **Azər Ələkbərov**

**Sabir Rüstəmxanlı. GÖY TANRI.**
*(Azərb. dilində.) Qanun — 2005, 416 səh.*

***Bu romanda Azərbaycan və Şərq tarixində böyük rol oynamış Oğuz xanın və qədim türklərin mənşəyi və keçdiyi yollardan, eləcə də, Təkallahlığın mühüm mərhələsi olan Göy Tanrı inancından danışılır. Həm mövzusuna, həm də yazı tərzinə görə əsərin çağdaş ədəbiyyatımızda mühüm bir hadisə olduğuna inanırıq.***

# ÖN SÖZ

Günçıxandan Günbatana hələ yalnız bir üzü tanınan yerin ortasında Tanrının öz sevgisindən yaratdıgı bir ulus yaşayırdı... Hansı minilin hansı yüziliydi?- önəmli deyil... Üstündən çağlar adlayandan sonra min il də bir il kimi qısa görünür... Tarixin dəfələrlə təkrarladığı olaylar gözündə bütövləşir; iki min yeddi yüz il öncənin bir yarpağı eynilə üç min yeddiyüz ilin o üzündən gələn bir nəğməni oxuyur; bir minildən qorunulub saxlanılan kiçik gil lövhə özündən çox-çox əvvəllərin də uzun zamanlarını əks etdirə bilir.

...Dünya onlarındı. Ansaq dünya sözü işlətmirdilər, yerlər-sular və ya acun deyirdilər. Aşılmaz dağları aşmış, sonsuz görünən düzənlərin sonuna varmış, yolları əriş-arğac eləmiş, qara qüzeyin buz dağlarını əritmiş, isti güneyin mərcan dənizlərində, güncıxanın günəş anası sularında yuyunmuş, günbatanın gedər-gəlməz yollarının sonunadək yürümüş, axırda yerin tam ortasını bularaq, "burdan yaxşısı yoxdur, hayana istəsək əlimiz yetər" deyərək yurd salmışdılar. Yer günəşin başına dolanan kimi, onlar da yerin başına dolanmışdılar. Dağ-dağ, irmağ-irmağ, göl-göl - hər gördüklərinə ad verə-verə adlanmışdılar. Yaradanın ilk

sözündən və ilk işığından gəlirdilər, bu sözü və işığı yaya-yaya, göyün sevgisini yerə, yerin borcunu göyə çatdıra-çatdıra, göylə yerin birliyindən doğan böyük, qutsal[1] bir yolla yürüyürdülər... Baş olmaq, başlanqıc olmaq, ilkinlik onların alın yazısıydı. Günəşlə ayın, göylə yerin, dağla aranın, gecəylə gündüzün əkizliyini də, ata-ana birliyi kimi yaranışın, var olmağın başlıca şərti saydıqlarından, yaşamaq, ömür sürmək üçün də bilərəkdən, ruhlarını bütövləşdirən qoşa çayları, qoşa dənizləri, qoşa dağları seçmiş, ilk ocaqlarını belə yerlərdə çatmışdılar.

Gumbul-gumbul davulları[2] çalındıqca yaratıq[3] ağzına su alıb heyrət içində dinləmiş, ildırım qılınclarının doğramadığı qalxan, ağ yeləkli, üç tinli ötkün oxlarının yetə bilmədiyi hədəf qalmamışdı. Tanrının böyük əkinçi əliylə ən saytal toxum kimi yer üzünə səpilmişdilər. Babil uçuqlarından tutmuş Sakit okeanadək ucsuz-bucaqsız bir evləri vardı. Bu boyda geniş torpaqlarda yaşayan qohum-əqraba ulusları, xalqları bir bayrağın altına toplamaq inanılmazdı. Bu başdan o başa bir ömür yetmirdi. Hərə öz yolunu seçib, öz alın yazısını yaşayırdı.

Min illər boyunca ana qucağı sayıb üstündə yaşadıqları bu genişliyin sərhədlərini kim, nə zaman cızmışdı? - Bəlli deyildi.

Biz, onların törəmələri, nəvələri, nəticələri, kötücələri, iticələri, budaqları və yarpaqlarıyıq...

Onların dilində danışırıq...

---

[1] Qutsal — Müqəddəs
[2] Davul — İri mərasim nağarası
[3] Yaratıq — Təbiət, məxluq

“Tanrı haqqı” deyib onların andını içirik...

Onların yaşıl göylərinə baxırıq, dünyamızı dəyişib uçub gedəndə də onların yanına qalxacağıq...

Ömür sürmüş, yaşlı-başlı dədələr özlərini yer üzünün ilk kişilərindən olan Olcay xanın törəmələri bilir, köklərini birbaşa Ulu Yaradana, göyə bağlayır, özlərini göydən gələn yaranqular[4], yəni göy insanı sayırdılar. Ulu ataları Tarqıtayı da Tanrıya bənzədirdilər. Tanrıdan gələn yolun yolçularının sayını Tanrıdan başqa kimsə bilməz. Neçənci olduğunu yalnız Tanrı bilən Tarqıtayın oğlu neçənciliyini yenə yalnız Tanrı bilən Dib Yabqu, Dib Uabqunun oğlu Qara xan... Şəcərə zənciri minilliklərə dolanırdı.

Söz yox ki, bu silsilə daha çox simgəsəldi[5], əsatirə söykənirdi, yan-yana ucalan onlarla zirvədən yalnız ən yüksəkləri seçilib adlandırıldığı kimi, keçmişdən də ən böyük kişilər, tarixin düyün nöqtələrində doğulub yaşamış, daha doğrusu təkcə öz millətinin deyil, ümumiyyətlə insanlığın taleyində əvəzsiz rol oynamış, tarixin yaradıcısı olan nəhənglər xatırlanır, onlaradək və onlardan sonra minlərlə el başçısı, hakimlər, sərkərdələr gəlib-getsə də, hamısının varlığı, işi, adı bir Böyük Kişinin kölgəsinə sığınır. Dib Yabqu yüzlərələ Dib yabquların, Qara xan yüzlərlə Qara xanların toplum adı, onların hamısının əvəzi, rəmzi olur... Bunların birindən o birinədək sürəcin min illərlə sayılması da burdan qaynaqlanır; tarixin adlamacı olmuş insanların aralarındakı yollardan yüzlərlə

---

[4] Yaranqu —İnsan

[5] Simgəsəl —Rəmzi

boy-buğum[6] keçsə də, öd-ödlək[7], yəni zaman yalnız tək-tək böyük adları qoruya bilib; görünür önəmli olan da bunlardı. Onların hər birinin minillərlə yaşaması haqqında köhnə inamlar da göydəndüşmə deyil. Tanrı ilk törənmişlərə uzun yaşamaq haqqı vermişdi. Min il, iki min il... Şumer şəcərələrində dövlət başçılarının iyirmi, iyirmi beş min il yaşadıqları da göstərilir. Sonra Tanrı öz yaratdığına qızdı və ömürlərini qısaltdı. Bizim andığımız, təsvir etdiyimiz insanlar da uzun yaşardılar... Deməli, hələ Tanrı yanında yerləri ucaydı. Nə vaxtın olayıdır bu? Yenə Tanrı bilər... Yaranışın körpəliyindən danışırıq... Yaşamaları şübhə doğurmayan, ancaq vaxt keçdikcə, çaglar içində əsatirə çevrilmiş bu kişilərin hər biri sonsuzadək yaşayacaq elmizin əbədi özül daşıdır.

---

[6] Boy-buğum — nəsil
[7] Öd-ödlək — zaman, zəmanə

# BİRİNCİ BOY

## TÜRKÜN TANRISI

O il hələ qış qurtarmamış Elin başı olan Qara xanın çaparları - bütün türk ellərini dolanıb, ulus bəylərini yazda keçiriləcək qurultaya çağırmışdılar. İl uğurlu gəldiyindən, el sıxıntıdan qurtardığından xaqanın könlü havalıydı. İlxılarını, sürülərini çöllər tutmurdu. Çaylar boyu əkin-biçinin bəhrəsini yığıb-yığışdırmaq olmurdu. Varıb şöhrətləndirdiyi, onardığı[8] yerlərdən gələn bac yurdunu illər uzunu geyindirib-kecindirməyə yetərliydi. Sevincini bəylərlə böləcək, oymaqlardan soraq tutacaqdı.

Gizli bir sağıncı-niyyəti də vardı. Otuz il Elə başçılıq edən, qorxu-ürkü bilmədən yağılar üstünə yeriyən, ölkələr alan, ən çətin savaşları alnına tər gəlmədən başa vuran, yüz kərə ölümlə üzləşib, qorxmazlığıyla Böyük Yaradanın Canalanını[9], qorxudan, iti baxışlarıyla onu geri göndərən Qara xan bu yaz ilk dəfə günəşinin dağlara əyildiyini duymuş, uyğusu pozulmuşdu. Özlüyündə qan qardaşlarıyla, elun başbilənləriylə gənəşib-qonuşub ötən günlərin unudulmaz, xoşbəxt anılarını bir

---

[8] Onardığı —qürurlandırdığı

[9] Canalan —Əzrail

daha bölüşmək, şənlənib qayğıdan qurtulmaq, o dünyaya yüngülləşib getmək istəyirdi. Bunu bəylər duymayacaqdılar. Öz könül dincliyi üçündü. Bir də xaqanlığın ondan sonra kimə çatacağı, hakimiyyətin kimin əlində olacağını bildirməliydi onlara. Törəyə[10] görə onun yerini kimin tutacağı bəlliydi. İndi gənc, ərgən çağında oğlu Oğuz xanın gücünü, ağlını görmələri bəyləri ürəkləndirər, hakimiyyət uğrunda çarpışmaların qarşısını alar, elin dayaqlarını möhkəmləndirərdi. Bu görüşü, bilərəkdən, elin yaylağa köçməsi ərəfəsinə, yaza, tanrılara qurbanların kəsildiyi Tapıq bayramı[11] günlərinə salmışdı. Şölən[12] bitəndən sonra bəylərlə bərabər, bəlkə də, ömrünün son yolçuluğuna gedəcəkdi. Ulusunun ən böyük tapınağı[13] - məbədi olan müqəddəs ünürə[14] - Ata mağaraya baş çəkəcəkdilər.

Alaca dağların gül-çiçək çağıydı. Yaylalara bulud əlçimlərinə oxşayan minlərlə alaçıq qonmuşdu. Qarı əriyib, suları çağlayan, köksü minlərlə rəngə boyanmış dağlar "gəl-gəl" deyə çağırırdı. Elin yaylağa, göylərin qonşuluguna yüksələn çağıydı.

Günəşin qızıl gözü güləndə qonaqların yolu açıldı. Uzaq-uzaq oymaqlardan at bağrı çatladıb gələn bəylər, baxalım, kimlərdi.

Öncə bayraqlarını çəkib qardaşları Or xan, Kür xan, Küz xan, başçılıq etdikləri bölgələrin pay-ürüşlə-

---

[10] Törə — Qədim türklər bu sözlə ana yasa, qanun, toplumun idarəsi kimi çox geniş anlamı ifadə edirdilər

[11] Tapıq bayramı — Qurban bayramı

[12] Şölən — şənlik, məclis

[13] Tapınaq — ziyarətgah, məbəd

[14] Ünür — mağara

ri ilə gəldilər. Bağır basıb, qucaqlaşıb xaqan qardaşların yanında yer aldılar.

Sonra günbatan ölkələrin göz dağı Alpər oğlu Muğan xan gəldi.

Sonra Kəngər ulusunun başçısı Tabakxan oğlu Ərkin gəldi.

Sonra Kabil, Sistan bəyi, Xalac ulusunun başçısı Ərdoğmuş oğlu Törəmək bəy gəldi.

Sonra Tabqac və Çinliləri diz çökdürən şanlı Uyğur ulusunun başçısı Alunca oğlu Alpdoğan xan gəldi.

Sonra quzey qəbilələrinin fəxri, qırx cüt itdən xizəyi, beş maral dərisindən kürkü olan Toboxan oğlu Duman bəy gəldi.

Sonra Qara qırğızların çiyni qızıl quşlu bəyi Tarduş oğlu Tengiz xan gəldi.

Sonra Altay çayları kimi köpürüb daşan Bögüxan oğlu Ənik bəy gəldi.

Saymaqla bitməz. Sonra Karluk, Dulu, Kuman, Talas bəyləri, Alatau, Altay, Xantenqri zirvələrindən qartaltək qopan, çöllərdən qasırğatək əsib keçən alp igidlər gəldilər.

Döyüşə qalxan orduda kim hansı cınagda, kimlə yanaşı yer alırdısa göy qübbəsinə bənzəyən çadırda, məclislərdə də ona uyğun oturardı. Bu birlik içində bir kökə bağlı olan xanların, el bəylərinin sevinci yerə-göyə sığmırdı.

Davullar vuruldu, qan qaynadı, surnaylar[15] səsləndi. İlan boğazından çıxmış çin qızları, qaravaşlar şərab payladılar.

---

[15] Surnay —zurna

Qara xan qonaqlarına söylədi:

- Uzaq yollar keçib xoş gəldiniz, bəylər. Elin yaxınından-uzağından soraq tutaraq yaxşımızı-pisimizi bir yerdə öyrənəlim, götür-qoy edəlim. Bir yerdə dinlənəlim, - dedi. - Yeyib-içəlim! Ov ovlayıb, quş quşlayıb, andan[16] sonra Ata ünürə varalım! Tapıq verib, atamıza baş əyib uğur istəyəlim. Ulularımızı sevindirəlim! - dedi.

Süfrədə sığır, keyik, qoyun əti təpələndi, çay kimi içətlər axdı.

Sırayla hər elbəyi son görüşlərindən bəri başçılıq elədiyi oymaqdan-bölgədən, ona qonşu olan yad ellərdən dəyərli saydığı, ya da narahat xəbərləri, bilgiləri çatdırır, dediklərinə başqa elbəyilərin və sonda Qara xanın münasibətini eşidir, elin taleyiylə bağlı hər hansı məsələyə elliyin münasibəti aydınlaşırdı.

Çox şeylərdən danışdılar, ancaq bu toplantıda üstündə ən çox dayanılan məsələ elin günçıxan ucundan gələ biləcək təhlükəydi.

Bu təhlükəni ilk yada salan Alınca oğlu Alpdoğan oldu. O, bəylərlə az-az görüşmələrinin sıxıntısını dilə gətirərək, adbaad hər kəsi ayrıca, təntənəli bir şəkildə salamlayandan sonra el üçün tarixlər boyunca baş ağrısı olmuş hiylə yuvası Çindən gələn soraqları yetirdi:

- Günçıxanda il ildən ağır gəlir, bəylər, - dedi. - Quraqlıq Çini qarsıdıb. Yağmur yağmır. Ormanlar ocaq kimi alışır. Çaylarda su yetmir. Gəmiləri işləməz olub. Gözləri bizə dikilib. "Necə olur bərəkətli yurdlarımız yağmursuz qalıb, əkin-biçinimiz külə dönüb, ancaq Bö-

[16] Andan —ondan

yük çöl çiçəklənir?", sorurlar. Bizim bolluğumuz canlarını sıxır onların. Vahimə içində gözləyir, dirçəlincə onları çığnayıb keçəcəyimizdən qorxurlar, - dedi.

Qara xan qımız dolu ayağı[17] yerə qoyub düşüncəli şəkildə:

- Çin çöksə, biz də çökərik, - dedi. - Yer üzünün o başına gedən ipək arğışları[18] gəlməz olursa, yolların get-gəli seyrəlirsə, biz də üzüləcəyik. Bu yol yüz illərdi bizim əlimizdədir. Çinə qazanc gətirdiyi kimi bizi də geyindirib-kecindirir, altunumuz axıb gəlir. Onların Günbatanda elçiliklərini yapan, birinin sözünü o birinə yetirib arada körpü quran da bizik, başımızın bəlası olsa da Çinin çökməsi sevinc gətirəməz, - dedi.

Alpdoğan onu dinləyib bir daha söylədi:

- Ancaq iş bununla bitmir. İpək arğışları seyrəlsə də yenə gələcək.

Bu yerdə Tabak xan oğlu Ərkin qatıldı:

- Məni də dinləyin. Bizdən keçən arğışların sayı azaldı. Bunun quraqlıqdan qaynaqlandığını Alpdoğandan duyduq. İpəyi özümüz yapaq, ipək qurdunu özümüz yetişdirək, dedim. Çinə araçı göndərdim, hələ soraq yoxdur. İpək parça toxumağı öyrənsək Çinin Batıya uzanan əlini kəsər, ipəyi biz özümüz verərik.

Alpdoğan sözünü sona çatdırdı:

- Təkcə ipəkdən- parçadan danışmıram, bəylər. Quraqlıq daha pis işlər törədə bilər. Yağmur daşının[19] soragı Çinə də çatdı. "Sadu daşı" deyirlər ona. "Onları

---

[17] Ayaq —qədəh, badə

[18] Arğış —karvan

[19] Yağmur daşı — Türk mifologiyasında buna Müqəddəs daş və ya Tanrı daşı da deyirdilər, hakimiyyət rəmzi sayılırdı

“Cadu daşı” qurtarır, daş əllərindəykən biz susuz qalacağıq, göyü, yağışı onlar idarə edəcək, - deyirlər”. Söz budur! Buna görə də yurdlarımızda yüzlərlə çin casusu dolaşır. Bəlkə sizin çadırlarınıza qədər gəlib çıxmışlar.

Bəylər yerlərində qurcuxdular. Qaşları düyünləndi. Ürəklərinə sızan şübhəylə öncə bir-birlərinə, sonra arada dolaşan kənizlərə, qapıda dayanan qaravullara baxdılar.

Alpdoğan bir anlığa ara verəndən sonra dedi:

- Yağmur daşını oğurlamağa, bizdən qoparıb Çin imperatoruna çatdırmaga çalışırlar. İmperatorun əli daşa çatmasa savaşa qalxacaq. Gərək Ulu Xaqanımız elimizin qismətinə düşən Yağmur daşını daha möhkəm qorusun.

Qara xan güldü:

- Qutsal daş göylərin payıdır. Göydən gələni göy özü qoruyur, - dedi. Yerlər-sular[20] yaradılan gündən bu daşı bizim ulusa göndəriblər. O, acun bəyliyinin[21] simgəsi olaraq, bizim əlimizdədir...

Bu sözlər şöləndəkilərin üstündən külək kimi əsib keçdi. Məclis uğuldadı. Yerlə göy arasında körpü sala bilən, ulusun istəklərini yerinə yetirən, dünya hakimiyyətinin açarı olan daş haqqında eşitməyən, bilməyən yoxdu. Bu daşın xaqanın əlində olması hamının ürəyinə toxtaqlıq, qürur gətirirdi. Bununla belə, ürəklərinə şeytan yol tapan özündənrazı bəylər də vardı, hakimiyyətin uzun illər boyu Qara xanın əlində olması, ondan sonra da oğullarına qalacağı onları üzür, gizlincə xaqana qısqanır, daşa yiyələnməyin yollarını arayırdı-

---

[20] Yerlər-sular —Bu sözlə Yer kürəsi anlamı ifadə edilirdi

[21] Acun bəyliyi —Dünya hakimiyyəti

lar... Çoxları xaqanın gücünü ordudan, idarəetmə üsulundan çox bu daşda görürdülər. “Yağmur daşı məndə olsa qonşular bizə dil çıxaramaz, yer üzündə baş əydirmədiyimiz ölkə qalmazdı”, - deyə düşünürdülər.

Xaqan şölənlərin ən unudulmaz yeri yemək-içməkdən sonrakı yarışlardı. Öncə yaraşığı göz alan, yerlə-göylə oynayan, çəmən-çiçəkdən seçilməyən atları çalğısıyla ruhu cavanlaşdıran savaş surnaylarının səsi altında çəkdilər ortaya. Əllərini yəhərlərin qaşına qoymaqla atların belinə sıçrayan gənclər yerlə, göylə əlləşən atlarını qulaq-qulağa düzdülər; az sonra ordadan uzaqlaşıb, ilğıma çevrilərək, yalı aşdılar. Yalun o üzündəki meşəyə yetişib, ordan dönəcəkdilər. Bir müddət sonra yurd kənarında tamaşa yerinə toplaşanların yeri titrədən qışqırıqlarıyla atlıların yenə eyni yerdən yalda görunmələri bir oldu. Sanki bir dəstə quş yerə toxunmadan eləcə yolun üstüylə, yerlə göy arasında süzə-süzə yaxınlaşırdı. Öndə gələn kəhər yığılıb açıldıqca günün altında rəngdən-rəngə düşürdü. Bir daha heç zaman dayanmayacaq kimi uçurdu. Ancaq Qara xanın tuşuna çatanda, birdən-birə yerə mıxlandı. Saçları rüzgarda dalğalanan ağ geyimli, ağ üzlü oğlan yerə sıçradı. Tamaşaçılar bir ağızdan qışqırdı:

- Oğuz, Oğuz!

Sonra çeşidli ellərin ərənləri gəldi. Ellərin, ulusların geyimini tanıyanlar, özəlliklərini bilənlər üçün onların hansının hansı eli təmsil elədiyini ayırd eləmək çətin deyildi. Yarış yenicə qızışır, atların sağrıları islanıb parlayır, qulaqlarının dibinə tər gəlirdi. Buna görə də onları saxlamaq mümkün deyildi. Cıdırın dalınca çövkən başlandı. At yarışlarından sonra ox at-

dılar, qarğı tulladılar, güləşdilər hər dəfə də yarışın sonunda "Oğuz, Oğuz!" sədaları yüksəlirdi.

Ərgərlik yaşına yenicə çatmış ağ geyimli, ağ üzlü Oğuz, yanında yarışların başqa qalibləri, seçilənləri, Qara xana yaxınlaşıb bağır basdılar, el böyüklərinə baş əydilər.

Bəylər, xanlar "Yaşa!", - deyib bir ağızdan onları alqışladılar.

Qara xanın gözündə yaş parıldayırdı. Yerindən durub, üzünü oğluna tutaraq dedi:

-Yarışların qalibi sənsən! Bu ödülü[22] ər kimi[23] qazandın! - dedi.

Sonra sağ tərəfindəki sağ bəylərə, sol tərəfindəki sol bəylərə, bütün qonaqlara üz tutaraq:

- Bu il yarışı oğlum Oğuz uddu, bəylər, - dedi. Mən iki sevinirəm, siz də bir sevinin. Oğuzun qolunu bükən yoxdur. At çapmaqda, qılınc çalmaqda, qurşaq tutmaqda eşisizdir[24]. Söz yarışında da eləcə... Eldə hər kəs bilir, tanıqdılar[25]... Savaşlardan başım açılmadı. O da mənimlə birdə çocuqluqdan ağır yollar keçdi. Yurdun bilginlərindən[26], xocalardan ög[27] aldı. Sizin adınızdan yarış armasını[28] ona verirəm, - dedi.

Üstündə yurdun damğası olan altun nişan əlində par-par parladı. Onu Oğuzun boynundan asdı. Qurd başlı, göy-qırmızı bəzəkli tuğ bağışladı oğluna.

---

[22] Ödül —mükafat
[23] Ər kimi —igid kimi
[24] Eşsiz —əvəzsiz, tayı-bərabəri olmayan
[25] Tanıq —şahid
[26] Bilgin —alim
[27] Ög —təlim, tərbiyyə
[28] Arma —mükafat, ərməğan

Oğuz bir daha bağır basıb, yarış yoldaşlarının, ərdəşlərinin[29] arxasına keçdi. Qara xan söylədi:

- Baxın, bəylər! Ölümdən qaçılmaz. Mənim inalım[30] - ortacım Oğuzdur. Elin tör başı, tac-taxt məndən sonra ona çatacaq. Törəmiz belədir. Söz yox, elimizin-günümüzün, sizlərin istəyinizə uysa!.. Biz yorulduq, o yorulmaz, biz yanıldıq, o yanılmaz! Elimizin adını yer üzünə yayar, yenilməz! Göylər onu öz sevgisindən yaratmış. Buna inanın! Məni sevənlər onu da sevsin. Mənə inananlar ona da inansın! Bir olun, birgə olun! Qanımızla qazandığımız topraqları qoruyun! Yer üzünün yiyəsi sizsiniz! - dedi.

- Ulu Kaqana eşq olsun! Göylər sizi qorusun! - səsləri çöldə, xalq arasında deyilən kimi yabanda[31], dağda yanğu[32] verib qayıdırdı.

Bunun dalınca bütün alan, meydan uğuldadı:

- Ulusun aslanı Oğuz yaşasın!

- Yaşasın, yaşasın!

Oğuzun işıq saçan üzünə qızartı çökdü. Qürurluydu, yarışı udmasına sevinirdi, ancaq şöləndə öyülməsinə sıxılırdı. Bu yığnaqda yalnız gücünü sınamaq istəmişdi. Bığ yeri yenicə tərləsə də saysız savaşlar görmüş, yaşca özündən böyük igidlərin qolunu bükmüşdü . Bu gün yaxın-uzaq ellərdən gəlmiş bahadırlarla bir daha özünü sınamış, tayı-bərabərinin olmadığını bütün türk ulusları bilmişdi. Bununla belə, babasının qonaqlara onun inallığını-varisliyini bildirəcəyini gözləmirdi.

---

[29] Ərdəş — dost, sirdaş

[30] İnal — varis, yaxın, ortaq

[31] Yaban — çöl

[32] Yanğu — əks-səda

Gözləri alacalanmışdı. Üzülürdü babasının sözlərinə. Yaşamı tükənir, ömrü bitirmi babasının? Sağlam, yorulmaz xaqan niyə dilə gətirdi ölüm sözünü. Sevənlərlə yanaşı sevməyənlər də var axı! Çin casusları elə bu gün yetirərlər: "Türk xaqanı yaşamaqdan yoruldu, savaşdan bezikdi, ölümə yığışır, gözdə-qulaqda olun!", deyəcəklər. Onun düşündüyünü düşünə, onun yapdığını yapa bilmərəm... Sonra: "Tanrım, babama yardım et!", - deyə pıçıldadı. Tanrı sözünü ürəyindən keçirtdi, pıçıltıyla dedi, çünki açıq söyləyə bilməzdi. El-ulus hələ onun Tanrısını tanımırdı. Elin 99 bütü-tengriciyi vardı. Hər şeyə tapınırdılar. Çaya, gölə, dağa, daşa, yola, qurda, marala, ilana, tısbağaya...Hər bölgənin öz tapınağı, bütü vardı. Hər şeyi tanıyırdılar, bir olan Göy Tanrıdan başqa! Oturanlardan kimsə onun Göy Tanrının elçisi olduğunu, Ondan başqa Yaradan tanımadığını bilmirdi. Bilsələr ulus pozular, el parçalanar, atası varisliyi ona verməz, yerinə balaca qardaşlarından birini hazırlaya, onu yurddan qovardı. Xaqanın, Elin inancından qopmaq, xaqan ailəsinin ənənələrinə arxa çevirmək ölümlə cəzalandırılan suçdu. Ürəyini açsa istəklərinə yetə bilməzdi. Babasına Tanrıdan uzun-uzun yaşamaq dilərkən taxta çıxmağa içindəki istəyin böyüklüyünü də duyurdu. Bunu birbaşa Tanrının tapşırığı sanırdı. Onun ismarışını ulusa çatdırmaq, yer üzündə Tanrının bir olduğunu, Göy Tanrıdan başqa yaradıcı olmadığını yalnız bu yolla bütün yaxın-uzaq qövmlərə yaymaq, bütün ölkənin inancına çevirmək olardı. Bu işləri görmək çağının yetişdiyini bilirdi Oğuz.

Babasının varisi olmağa göylərin onu seçdiyini ilk kəs ustadı Uslu Xocadan duymuşdu. Sonra babası anlatmışdı. Buna görə də Qara xan illər uzunu onu özündən ayırmamışdı. Savaş oldu savaşa, ov oldu ova, yarış oldu yarışa aparmışdı. Erkən yaşlarından bərkdən-boşdan keçirmişdi...

## YAĞMUR DAŞI

Yazın oğlan çağı, gecəylə gündüzün bərabərləşdiyi, yeni ilin bayram edildiyi gündən ay yarım ötmüş dağlarda bütlərin qorunub saxlandığına, eyni zamanda türkün xilaskarı olduğuna görə müqəddəs sayılan mağaralara qalxaraq tapıq vermək, qurban kəsmək el-obanın yaşı bilinməyən törəsiydi. El qurultaylarını da, böyük gənəşmələri də həmin günə salardılar. Bəylər, el başçıları ölkənin qayğılarını paylaşmaq, məsləhətləşmək üçün günlərlə at qovar, ağlasığmaz uzaqlıqlardan qanadlanıb gələr, görüşdən birgəlikdən duyduqları sevinclə bütün acılarını, savaş üzüntülərini unudardılar.

Şənliklər Ata mağaraya yürüşlə sona çatardı. Qara xanla qonaqları toyun sonuncu axşamını süfrə başında keçirsələr də, hamı ayaq üstəydi, yürüş ovqatı eli bürümüşdü. Dan ertə böyük bir köç Tanrı dağına üz tutacaqdı.

Oğuz ustadı Uslu Xocaya uğrayaraq dedi:

- Babam məni türk böyüklərinə tanıtdı, ortacım budur, dedi.

Uslu Xoca onu bağrına basdı:

- Gözümüz aydın olsun!

- Törəmizcədir bilirəm, ancaq belə tez açıqlayacağını gözləmirdim! Bacararammı?

- Sən xaqanlığa doğulmusan! Çağı gələndə babanın yerini tutacaqsan. Onun bacardığından daha gözəl işlər bacaracaqsan! Elin adını göylərə qaldıracaq, yer üzünün hər yanına yayacaqsan! Alın yazısından qaçılmaz, oğul! Sən yetgin bir igidsən. Yaradan içini işıqla doldurub. Elimiz-günümüz Sənə güvənir! Baban bunu hamıdan yaxşı bilir !

Oğuz qayğılıydı:

- Üstümüzü qara buludlar bürüdü, ustadım! Ağır günlər gözləyir yurdu. Gündən-günə boy atır bu qorxu. Alpdoğan doğru dedi. Quraqlıq Çini soldurub, diz üstədilər. Buna görə də getdikcə quduzlaşırlar! Babam istəsə bitirərdi onları. Bütün çağlarda olduğu kimi, “yağı da olsa, qonşudur. Quraqlıqla sınağa çəkildikləri günlərdə üstlərini alsaq ərlik sayılmaz”, deyir. Di gəl, bu durumlarında da hiylələrindən əl çəkmirlər. İndi də Yağmur daşının izinə düşdülər. Casusları qarınca kimi qaynayır.

Uslu Xoca yetirməsinin düşüncə gücünü dəfələrlə yoxlamışdı. Onun yanılmadığını bilirdi. Qonşularla bağlı onun da deyiləsi sözü çoxdu. Çini alıb elə bağlamaq türk xaqanları üçün çətin deyildi, ancaq bu, işin başlanğıcıydı, əsas aldığını, ram etdiyini törəyə uyğun yaşadıb idarə eləməkdi. Qalabalıq, adam çoxduğu Çini yönətməyi çətinləşdirirdi. Türk sayca onlardan az olduğuna görə əriyib gedirdilər Çinin içində. Bunları bir daha dilə gətirib yetirməsinə anladandan sonra dedi:

- Yağmur daşı elin güvəncidir. O qorunmalıdır, yağı əlinə keçməməlidir. Ancaq söz açdın, deyim! Daşa bu inamın hardan qaynaqlandığını kimsə bilmir.

Qaraca dağların ətəklərində parlaq qara daşlar vardı. İnəklər su tapmayanda o daşları ağızlarına alar, dırnaqlarıyla yeri eşərlərdi, susuzluqları yatardı. Olsun kim, ordan başlanmışdır bu "Cadu taşı" qovğası...

- Sənin hər deyilənə inanmadığını, hər işin kökünü, doğrusunu aradığını çox görmüşəm, ustadım. Ancaq Yağmur daşı gerçəkdir. Çocuqkən bir kərə görmüşəm onu babamın əlində. Üstündə damğa var: səkkizoxlu, Tanrı damğası.

- O daş yerlər-sular yaranandan türkün əlindədir. Düz deyir tabğaçlar, Yağmur daşı deyil, "cadu daşı" dır. Çünki insanları, elləri üz-üzə gətirir, qardaşı qardaşdan ayırır... Hər kəs ona can atır. Bizləri ucaldan o daş deyil. Savaşlarda axıtdığımız qanlardır, düzlüyü sevməyimiz, böyük-kiçik yeri bilməyimiz törəyə uymağımızdır.

Oğuz dedi:

- O daşın nəliyini bilirəm! O sayı bilinməyən xırda, yapma bayatlardan[33], bütlərdən, tözlərdən birisi deyil. Nə başlanğıcı, nə sonu bilinən, yerin-göyün yaradanı, türkün babası olan Göy Tanrının daşıdır. Bir olan Tanrıya tapınanların qut daşıdır. Məndən öncə gəldi o, ancaq yiyəsi bizik. Mənəm! Onun dilini məndən başqa bilən yoxdur. Gücünü mənim əlimdəykən göstərəcək. Hər ulusu mutlu[34] qılmaz!

Uslu Xoca ərgənlik yaşına yenicə girən yetirməsinin vergili olduğunu bilirdi. Bilgisini ona verdikcə özü də ondan öyrənmişdi. Öngörmə başarısını, ruhunun, ağlının-usunun ucalığını dönə-dönə sınamış, onun

---

[33] Bayat, çalab, töz, burxan — yaradan, tenqri, iyə anlamında işlənən sözlər

[34] Mutlu — xoşbəxt

göylərə bağlılığını duymuşdu. İnancının düzlüyünü başa düşərək qəbul etmiş, Tanrıçılıq yolunu tutduğunu Oğuza sezdirmədən işin yetişməsini bəkləmişdi. Bu yaşlı bilgin, yerin, göyün bütün gizlinlərindən xəbərdar olan el agsaqqalı, bögü[35] Oğuzun yer üzündə gördüyü ən işıqlı kişiydi. Düzlükdən başqa yol tanımırdı. Sözüylə işi birdi. Ürəyi elə, ulusa sevgiylə çağlayırdı. Onunla bir kərə üz-üzə oturan, söz kəsən ömrü boyu onun təsirindən çıxa bilməzdi.

İllərlə Oğuza yerin-göyün sirlərini öyrədən, onu bilgiləndirən, gecəsi-gündüzü onunla birgə keçən Xocaya yetirməsinin doğrudan-doğruya göylərə bağlı olduğunu, bir olan Tanrıdan güc, ög aldığını, doğuşdan el başçılığına doğru yol gəldiyini sezmək çətin deyildi. Onunla keçirdiyi bütün çağlara bu yolu yaxınlaşdırmaq işi kimi baxırdı. Türk zatən göyə bağlıydı. Göy - ata, ök[36] ana deyib, göyü başlanğıc, yeri ona bağlı sayırdı. Ancaq Oğuz Tanrını göydən də uca tutur, onu göylərlə yerlərin yaradıcısı sayırdı. Bir Tanrı - bir xaqan deyirdi... Di gəl, başının kiməsə bağlı olmasını istəməyən el-ulus böyüklərinə əl verməyəcəkdi bu... Bir olan Ulu Tanrıya tapınırkən özündən razı xanların, xaqanların sayı bilinməyən, uydurma tenqricikləri kimsəni inandırmazdı. Buna görə böyük Tanrıya aparan yolun açılmasını, bu yolu hər kəsin görməsini istəmirdilər; yer üzünü bölük-bölük elədikləri kimi, Ulu yaradanı da yüzlərlə tenqriciklərə, minlərlə burxanlara, tözlərə, çələblərə, bütlərə çevirmişdilər.

---

[35] Bögü — filosof

[36] Ök — yer

Özləri bir olan Tanrının əliylə yaradılmış kişilərin çamurdan, ağacdan yapdıqları bütlərə inanması İnsan oğlunun ən böyük utanc yeri olaydı gərək. Yer üzünün bəyi olan ulusunun keçmişini yaxşı bilirdi Oğuz. Öz ilkin sorağı on min ilin o üzündən gələn "Bir tanrı" inancını buraxıb, qonşuların sırıdığı cici-biciyə tapınmasının kökünü öyrənmişdi və bundan sıxılırdı. Yüzlərlə tenqricik - yüzlərlə yol, yüzlərlə yöndür; sonunda ulusun param-parça bölünməsi deməkdir. Bu ruh bağlılığı deyildir. Saldırıdır[37], savaşdır, ulusu içdən qamarlamaq, işğal etmək və çökdürməkdir. Oğuz bunu görürdü.

Yağılar savaşlardakı məğlubiyyətlərinin-yenilgələrinin[38] qarşılığını bu yolla vermək, öclərini[39] bu yolla almaq istəyirlər. Türk ulusü da gözübağlı tutub bu yolu. İlkin inancını unudub, onun göy övladı olduğu, göydən gəldiyi indi ancaq bir ovuc qamlara, alimlərə, bilginlərə bəllidir. Çölləri bütlərlə doldurublar. El anlaşılmaz qurd-quş ruhlarının əlində qalıb.

Oğuzun duyduğu təkcə bunlar deyildi. Dil açandan Tanrı demiş, yaşıdlarını böyüklərdən xəbərsiz üzünü göylərə çevirməyə, yaradanın birliyinə tapınmağa çağırmışdı. Yer üzünü qurtarmağın yolunu Təktanrıçılıqda, yer üzünün bütün insanlarının bu inanc çevrəsində birləşməsində görürdü, həyatının, düşüncəsinin kökü, mənası bundan ibarətdi. Anasından başlamış, az sayda ən yaxınlarına, dost-sirdaşlarına gecə-gündüz söylərdi bunu. Onlardan ən böyüyü Uslu Xo-

---

[37] Saldırı — hücum, basqın
[38] Yenilgə — məğlubiyyət
[39] Öc — qisas

caydı. Ancaq tək-tək adamların bilməsi yetərli deyildi. Bunu indi anlamışdı. İnanc dəyişimi ölüm-dirim yoludur. Xaqanlar başlasa belə, sonu uçurumdur. Di gəl, başqa yol da yoxdur... Oğuz babasının yerini tutacağını da Göy Tanrının istəyi sayırdı, "mən xaqan olsam, ulusun üzünü göylərə çevirəcək, elin bir inancı, bir tapınağı olacaq", - deyirdi.

Xan babası öndəykən dövlətin idarəçilik işinə qarışmağı ailə, oğuş gələnəklərinə sayqısızlıq olardı; türk törəsində bu, yolverməzdir; ancaq varis-ortac seçiləndən sonra başqa yol qalmırdı, babasından sonra üzləşəcəyi çətinlikləri bildiyindən kimə arxa çevirəcəyini araşdırır, yığıncaqda eşitdiklərini incələyir, qonşuların başladığı oyunun gətirə biləcəyi sonucları, fəlakətləri düşünürdü.

Göyün gücünə, qutsallığına inamın keçmiş çağlardan bəri türklərin ruhuna yabancı olmadığını, min illər boyu ulusun günəşə, göyə bağlı olduğunu, bu inancı öncələr də yaymaq istəyənlərin gəlib-getdiyini türk içində çoxları bilirdi. Uslu Xoca bu barədə yetirməsiylə çox danışmışdı. Ancaq Oğuzun Göy Tanrı inancı - bütövdü, insanın içini işıqla, ümidlə doldururdu, ikifikirliliyə yer qoymurdu - ya hə, ya yox! Birini seçəcəksən! O, içində uydurma yer inanclarına - daş, ağac, saxsı bütlərə qəribə, bəzən hətta izah oluna bilməyən bir nifrət duyur, onlara ikrahla baxırdı. Məgər dünya görmürmü ki, bunlar yaradan ola bilməzlər, özləri yaradılmışlardır, yönəldən ola bilməzlər - çünki özləri yönəldilənlərdir. Göyün şimşəyi - ağacı qurudur, yağmuru - çayları daşırır, ulduzu - yol göstərir, günəşi - yazı-qışı doğurur, yer üzünə can verir. Ağac, palçıq, daş, qum ta-

pınaqlar Göyün qarşısında gücsüzdür, cılızdır. Deməli, bütün ruhların Atası kök, başlanğıc, qutsal olan Göydür. Göydə oturan, yerləri, suları, ulduzları yaradan Ulu Tanrıdır! Yalnız O, ilki, sonu olmayan, İnsan oğlunun zorundan, pisliyindən yuxarıda dayanan, əlçatmaz və görklüdür[40]! Bütün yaradılmışlar onun işığı, qol-budağı, ayrıntılarıdır. Səhər-axşam, yaz-qış, iyilik-kötülük, doğum-ölüm ona bağlıdır. Ağacdan, daşdan tenqricik yapıb ona tapınanlar tanrı övladı olan ulu ulusumuzun kökünü danmaq, bizi göydən qoparıb yer ilan-qurbağalarına çevirmək, qismətimizə düşən Tanrı gücünü almaq, türkü kiçiltmək istəyənlərdir. Od olmasa, tüstü çıxmaz! Ulusunun göyə bağlılığını həyatının hər anında damarının göylərlə bir atdığından, göylərin ovqatını öz içi kimi duyduğundan, göyün də onu duyub, onu eşitdiyinə inandığından görürdü... Türk ulusu doğaldan[41], içdən Günəşçiydi, Göyçüydü, Tanrıçıydı, Tanrının təkliyinə inanandı. Di gəl, büt-burxan alverçiləri ruh-inanc işini də yerin oyunbazlığına çevirmişdilər. Görklü ulusunu yenidən göyünə, tanrısına, ucalığına bağlamaq gərəkirdi!

Oğuz xan gözünü açandan içini bu duyğuyla, bu işıqla dolu görmüşdü. Üzünün aydınlığından şaşırıb ona Ağüz demişdilər. Qıyık, çəkil gözlülər, yumru sifətlilər onun sivri, irəliyə yönəli sərt sifətini oxa bənzədib, oküz söyləmişdilər.

Yağmur daşını görərkən - onun adicə bir çay daşı olmadığını, damğasından işıq saçıldığını, üzə güldüyünü də təkcə o görmüşdü.

---

[40] Görklü — gözəl

[41] Doğal — təbiətən

Uşaq yaddaşına düşən ilk pozulmaz izlər də Xan babasının bu daşa inanmağındandı. Yer üzünün eşsiz böyüyü saydığı babasının daşa yanar gözlərlə baxması uşağın diqqətindən yayınmamışdı; onun daşı əzizləməsində, qorumasında bir az da qorxu vardı; yumruğ boyda olan daşı gülə-gülə Oğuza uzatmışdı:

- Al, görüm gücün çatır?!

Daş ağırdı, ancaq Oğuz bu ağırlığı sezmədən daşı əlində oynadıb, atıb-tutmuş və həmin anda daş onu da qorxutmuşdu. Qara kömürə bənzəyən daş kənardan üfürülürmüşcəsinə içindən işarıb işıqlanmağa başlamış, iri bir gözə dönüb Oğuza dikilmişdi. Bu Tanrının gözüydü, onda yer üzünün ən sirli, ən müqəddəs, ən ulu sözü yazılmışdı. Oğuz uşaq ağlıyla bu daşın yalnız onun üçün işıqlandığını, yalnız ona baxdığını anlamışdı. Bunun Göy Tanrının minlərlə gözündən təkcə biri olduğunu duymuşdu. Daşa toxunduğu o ilk gündə o başqa kimsənin bilmədiyi çox şeyləri başa düşmüşdü.

Bu bir anlıq işıqlanmanı babası da gördümü? Görmüşdüsə də üzə vurmamışdı. Ola bilsin, daşın yalnız Tanrı savçılarının[42] əlində işıqlandığını Qara xan da bilirdi, ola bilsin, bu seçilmişliyi o təkcə xaqanlıqla bağlayırdı, el başçılığından belə tez üzülüşmək istəmirdi. Gördümü, görmədimi, sezdirmədi, Oğuz hardan qaynaqlandığı özünə də bəlli olmayan bir duyğuyla daşın onun əlində canlanmasının Tanrı buyuruğu sayıldığını, Tanrı sözünün onun alın yazısı olduğunu, gələcəyi ilə bağlılığını anlamış, ancaq babasının susduğunu görüb, o da susmuşdu.

---

[42] Savçı — peyğəmbər

Qara xan daşın közə döndüyünü görməsə, üstündəki damğanın anlamını bilməsə də, daşın gücünə, qutsallığına, göydən gəldiyinə, yer üzünə yiyələnməyin tək yolu olduğuna inanırdı.

Bu yumru daş yerin bənzəridir, kimin əlindədirsə, yer üzü onundur. Deməк yaşıl göyü, yağız[43] yeri, günü, ayı, gecəni, canlıları, ödü, ödləyi törədən Tanrının sevgisi onun ulusunadır.

Ərkli[44], mənqu[45], güclü, başların başı, öydüyüm uca Tanrı, Ataların Atası, xan Tanrı, xaqan Tanrı, türk Tanrısı, başım sənə qurban olsun!

Oğuzun bütün yeniyetməliyini bu duyğu, bu güvənc doldurmuşdu. Daşı aramasa da onun qorunduğunu, təkcə babasına bəlli olan bir yerdə saxlanıldığını bilirdi. Onsuz da gələcək xaqan olduğundan tezliklə daşın harda qorunduğu ona da deyiləcəkdi... Bu gizlin yalnız ona açıla bilərdi. Elin törəsi beləydi.

Başlarının üstündən Göy Tanrı yaratdığı ulduzların gözləri ilə Oğuza, çocuqluqdan bəri ona atabəylik[46] etmiş Uslu Xocaya baxırdı. Qarşıda ertəsi günün uzun yolçuluğu vardı...

---

43 Yağız — qara mənasında (qara torpaq)

44 Ərkli — güclü

45 Mənqu — əbədi

46 Atabəylik — burada ustadlıq, müəllimlik

## ÇİN DUSTAĞI

Tülü alaçığını ordanın qırağında qurmuşdu. Çin dustaqlığından dönəndən bəri elə qaynayıb qarışa bilmirdi, çəkinirdi. Gəlişinə el sevinsə də özü sevinməmişdi. Yurda doqquz illik ayrılıqdan sonra qayıtmışdı. Çindən dönən az olur. Dustaqdan qurtaran da çölə könülsüz qayıdır. El qınağından qorxurlar. Savaşdan, yürüşdən, çöl həyatıının ağırlığından bezginlər də tapılır, ulusa qayıtmaqdansa bir az da uzaqlaşır, dustağı olduğu ölkənin gur kəndlərinin tünlüyündə itib, gözdən yayınmağa çalışırlar. Kimliyini, yabançı olduğunu gizlətməklə özü də unudulmağ istəyir. Geri dönmədiklərinin səbəbini anlamaq çətin deyil. "Yad əlinə keçməkdənsə ölümün əlinə keçəydilər! Nədən əsir düşdülər?" suallarını cavablandırmaq, xalqı dediklərinə inandırmaq ağır gəlir onlara, satqın görünməkdənsə, öz elidə başıaşağı, şübhə altında yaşamaqdansa biryolluq üzülüşüb yad ellərdə qalmağa üstünlük verirlər. Məğrurluq yurda dönən yolları bağlayır...

Ancaq yad eldə gizlənmək, gözdən yayınmaq da asan başa gələn iş deyil. Düşmən döyüşdə yaralanıb əsir düşənlər bir yana, təsadüfən, yol azaraq dustaq düşənlərdən də əl çəkmir. Su arxlarını kimə qazdır-

sın, qalaları kimə ucaltdırsın bəs? Qaranlıq zindanlardan buraxılanlar qul kimi satılır, səhərdən axşama işlədilir, min yalanla yurda dönüşlərinin qarşısı alınır. Bu yalanlar illərlə qaranlıq divarlar arasından çıxmayanların çoxunu çaşdırır. Bir də hansı üzlə qayıtsınlar axı? Ləkələnmiş ad, sınmış qürur... kim baxacaq üzlərünə? Ölmüş bilirlər, qoy bilsinlər. Alın yazısı beləymiş. El səni unutdu, özün də unut!

Ancaq Tülü qayıtmışdı. Özü də tək deyil, Çin qızı Don Xi ilə, yanlarında bir cocuqlarıyla.

Əsirlikdə çəkdiklərini, çinlilərin insanlığa yaraşmayan zülmlərini yada salmaq istəmirdi. Üç il başabaş hər gün soyundan-kökündən olan kişilərin alçaldıldığını görmüşdü. Sonra altı il qamçı, kötək altında səhərdən axşama işləmiş, torpaq atmış, qala divarı ucaltmış, yağı evinə bəzək vurmuş, hər gün də yaradandan ölüm arzulamışdı. Ölümün yerinə Don Xi gəlmişdi. Qalaya daş qaldırdığı zaman yıxılıb ölümcül qaldığı yerdən onu çıxararaq, qaranlıq düşəndə evlərinə aparan, günlərlə başının üstündə dayanaraq sağaldan, sonra əsirlikdən qurtaran bu qız olmuşdu. Evlənmişdilər. Yurduna Tülünü Don Xi gətirmişdi. "Sən çöllüsən, dağ-aran adamısan, fikrin ordadır. Düzünə qalsa çöl məni də çəkir". Yarı çinli, yarı koreli qız neçə arxadan gələnini sadalayır, sonda damarında türk qanı da tapırdı:

- Sən harda, mən orda!

Onu elinə qaytarmaq üçün Tülünün düşüncəsi yetməyən yerlərə əl atırdı. "Sən nə birincisən, nə də sonuncu. Yandan-yabançıdan evlənmək sizin əski adətiniz, gələnəyinizdir. Azmı qızımız var kəndlərinizdə?"

- Bunun gələnək olduğunu hardan bilirsən? - sormuşdu.

- Çində türkün hər addımı izlənilir, hər sözü deyilir. Əski çağlardan belədir. Ərgənəkon soylamalarınıı biz də eşitmişik. Türk boylarının çoxunda erkək içdəndir, ana isə - çöldən gəlib, qurddur. Buna görə çox vaxt evlənməyə kənardan qız aramısınız. Mayanız belə tutulub. Özünüzü tanıyan kimi cumursunuz üstümüzə. Çin xaqanlığının başında türklərin dayandığı çağlarda da böylə olub.

Tülü Don Xinin türk eli-günü haqqınla bu qədər çox şey bilməsiri ona olan sevgisi ilə bağlamış, onun səmimiyyətinə inanmışdı. Qızın öyrədildiyini, başına gələnlərin qurama iş olduğunu ağlına sığışdıra bilməzdi. Elinə-ulusuna qızın bu istəyini görəndə kövrəlib bunu Don Xinin ana tərəfdən korelərdən gəldiyiylə bağlamış, onu yer üzünün ən gözəl xanımı saymışdı.

Yurdda hamıdan qaçıb yalqızlaşdığı halda Don Xinin onun qohumlarına ayaq açmasını, burdan vurub ordan çıxmasını, soraqlaşa-soraqlaqa ordadakı bütün çinlilərlə ilişik qurmasını da Don Xinin bacarığına yozur, yoluna beləsinin çıxmasına sevinirdi.

Bəylərin saraya toplaşdığı gecə Don Xinin uyğusu qaçmışdı. Alaçığın qarşısındakı ocağı sönməyə qoymur, kilimin üstündə bardaş qurub gecə ilbizlərinin, çəyirtkələrin səsinə bənzər bir çiviltiylə Çin mahnılarını zümzümə edərək Tülüyə corab toxuyurdu.

Gecə yarısı ona oxşayan bir qız qaranlıqdan çıxıb gəldi, öncədən danışılıbmış kimi, soruşmadan, ocağın qırağında onunla yanaşı oturdu. Baş-başa uzun-uzadı pıçıldaşdılar. Gələn Qara xanın çadırında

yemək-içmək paylayan qırnaq[47] - qaravaşlardan biriydi. Kölgə kimi gəzib-dolaşdığı sarayda hər şeyi görür, bilirdi. Çindəki quraqlıqdan başlamış, karvanların keçdikləri yollara qədər... Çindən gəlib uzaq Günbatan torpaqlarına gedən karvanların yolu yer üzünün, hələ ki, ən uzun alış-veriş, tanıma, soraqlaşma yoluydu. Düzdü, Quzeydə Başqurd elindən keçib Batıya uzanan Xəz yolu da vardı. Ancaq o İpək yolu qədər işlək deyildi. İpək yolunun üstündəki ulusların yaşamında, düşüncəsində hansı dərin izlər buraxdığını olduğuca anlayıb-dəyərləndirmək çətindir. Çünki axın təkcə İpək yoluyla bitmirdi, bir arğış-karvan dayanan yerdən başqası yüyürürdü. İpək yolunun malları son dayanacaqlardan şaxələnən yollarla yer üzünün ən uzaq nöqtələrinə yayılırdı. Ancaq bu yol alqı-satqı ilə birlikdə, eyni zamanda bir-birindən bu qədər uzaqda yaşayan insanların xəbərləşmə, bilgi alıb-vermə, çeşidli gəlişmələri yerin bu ucundan o ucuna ötürmə yolu idi. Bu yol Çindən çıxandan qonşu ulusların Pont adlandırdığı Qara dənizi, Günbatan dəniz deyilən Aralıq dənizini adlayana qədər türk ellərindən keçirdi. Yolun minillər boyu açıq, qorxusuz qalması türklərin xoşgörüsünə, düzlüyünə, bütün ellərə yardım göstərmək istəyinə bağlıydı. Onlar bu yolu İpək yolundan çox Türkün yolu bilirdilər. Gözlərinin önündən keçən bu yollarla Çindən Günbatana, Günbatandan Çinə hansı qarmaqların atıldığını olsun ki, düşünmürdülər. Yüz illərdi bir çox ölkələr Çindən ipək alsalar da onun nədən, necə yarandığını öyrənə bilmir-

[47] Qırnaq — kəniz

dilər. İpək alverinə girənlər arasında hər zaman bu gizlini öyrənmək istəyində olanlar da vardı. Çin bunu bilirdi, bilib də barama işini onlardan örtülü saxlayırdı. Təkcə türklərlə bacarmırdı. Onlardan gizlin heç nə yoxdu. Di gəl, bu yaxın, qorxulu qonşu yazılmamış bir gələnəklə Çinin bu gizlinini, sirrini açmırdı. Satqınlıq, birinin sözünü başqasına çatdırmaq türk düşüncəsindən uzaq bir işdi. Bununla belə, Çinin qonşularıyla iç-içə yaşamasının, hər ordada, kənddə elçi saxlamasının bir səbəbi də burdan Günbatana gedən bilgiləri öyrənmək, Çinə qorxu yarada biləcək nəsnələri önləmək, eləcə də, öncə türk arasında, sonra qonşu ellərdə ortaya çıxan bütün yeni savaş ürünlərinin[48] çeşidlərini xaqanlığa yetirməkdi.

Bu gizli çin torunun bir ucunun onun evində olduğuna Tülü inanmazdı.

Ocağın işığında Don Xin ilə saray qaravaşının üzləri əyri işlərdən çox uzaq, göy ruhları qədər təmiz görünürdü. Bu görkəmlə türk ərlərini deyil, Tanrının özünü də yoldan çıxarmaq olardı. Qonaq Don Xini qucaqladı, sonra qaranlığa qarışıb itdi.

---

[48] Ürün — burda silah, əşya

## TANRI DAĞINA YÜRÜŞ

Dan ertə, dağların yay-qış agappaq olan zirvələri hələ işıqlanmamış Qara xan qonaqladığı bəylərlə birgə ordadan ayrıldı. Sanki yer tərpəndi. Ata Mağaranı yoluxub, orda qurban kəsmək hər adamın yetişə biləcəyi iş deyildi... Elin-gününlə birgə olanda bu yolçuluğun gözəlliyi daha da artır. Ata Mağara bir yana, keçilən yollar da qutsallaşır. Türkün el başçılarının, adlı-sanlı bəylərin bir arada olması bu yolçuluğa xüsusi bir ruh və gözəllik verir, köçdəkilər uzun müddət bu səfərin təsirindən çıxa bilmirlər.

Səfərdə Qara xanı xaqan ailəsindən qardaşı Güz xanla Oğuz müşaiyət edirdi. Yurdda qalanların müdafiəsi Gür xanla Or xana tapşırılmışdı, onlar həm də daşınması çətin olan malları, yaşa dolub yola çıxmaq istəməyənləri, sürüləri, ağılığın[49], yəni xəzinənin geridə qalanını qoruyub yaylağa qaldırmalıydılar.

Gündoğandan Günbatana ulusun çeşidli qollarına vətən olan Altayın, Xantenqrinin, Koğman-Sayan dağlarının, Alatau ilə Karataunun, Tibet-Tanqut yaylalarının müqəddəs sayılmasının bir səbəbi də, bəlkə,

[49] Ağılıq — xəzinə

altun, daş-qaş xəzinəsi olmalarından daha çox, buralarda yalnız xaqanların bildiyi bəlgələrin[50], yazıların, xalqa məxsus olan xüsusi mirasların saxlanmasıyla bağlıydı.

Mağaraları hər yaz minlərlə insanı bir araya gətirən, xalqı birləşdirən sehirli bir tapınağ, bir inanc yeri, qutsal bir ziyarətgah sayaraq qoruyanlar onun millətin taleyində oynadığı rolu da unutmamışdılar. Ağır günündə soyu-uruğu qorumuş, türkün beşiyi olmuşdular. Buna görə ilin bu çağında bütün beşik-ünürlərə, tanınan mağaralara gedilir, qurbanlar kəsilirdi.

Qara xanın ulusunun ən çox sevdiyi, dəyişilməz qurbanlıq yeri, indi gedəcəkləri Ata Ünür dedikləri Ata Mağaraydı... Ancaq Qara xan başqa Türk dağlarındakı mağaralara da varıb qurbanlar kəsmişdi.

Qara dağın ətəklərindən ötüb günçıxana döndülər. Bol sulu Talas çayını, Muyunqumu adlayıb, günçıxana dogru üz-üzə iki sıra uzanan, başı buludlardan seçilməyən bəyaz çalmalı, yamacları yam-yaşıl Alataunun arasındakı geniş düzənliyə endilər. Göz işlədikcə uzanan bu düz heyvan-qara bəsləməyə eşi olmayan, bəhrəli yerdi, köç gedə-gedə yorulmaq əvəzinə dincəlirdi. Düzün quzey yaxasıyla Böyük Alataunun ətəyiylə gur sulu Çu axıb gedir, üz tutduqları Issık, yəni isti gölün sularını günbatanın susuz torpaqlarına daşıyıb aparırdı. Çay yaxası, dagların ətəkləri və aşağı yamacları yerli tayfaların ag alaçıglı obalarıyla bəzənmişdi. Çay boyu qalxan əski karvan-argış yolu onları dar dərəyə dartırdı.

---

[50] Bəlgə — sənəd, yazı

Axın dərəni, Çudan sagdakı-soldakı yamacları doldurdu. Yuxarı qalxdıqca çay yatağı genişləndi, köç yamaclardan enib bütövləşdi, aşırıma qalxıb, İssık göllə üz-üzə dayandı. Bu, günlərlə gözlənilən, hər il təkrarlansa da duyğusallığı azalmayan, köçün içindən qasırğa kibi keçib gedən bir andı.

Bəylərlə birgə olduğuna, savaşa, yürüşə yox, ziyarətə getdiklərinə görə, Qara xan tələsmirdi, yolun uzağını, agırını seçmişdi. Gölün quzeyiylə gedən əski el yolundan sağa dönüb güneyə adladılar. Güney Alataunun ətəklərində ordalanıb yol yorğunluğunu çıxartdılar; atlarını göldə yudular, sonra gölün qarşı sahilləri boyu ucalan, ətəkləriylə irəlilədikləri dağların əkizi olan, eləcə uca, eləcə başı qarlı, zirvələri gündə neçə kərə buludlara bürünüb açılan üzbəüz dağlara tamaşa edə-edə, yolların davam etdilər. Atları yormadan, bəyəndikləri yerlərdə dincələ-dincələ, yollar boyu yarışaraq, ov ovlayıb, quş quşlayaraq, bu savaşsız yazın, bu birgəliyin xoşbəxtliyini cana sinirərək gedirdilər. Arada düşərgə salıb bütün gecəni dincələndə, ordanın tonqallarının ucu-bucağı görünmürdü. Heyvanlar yemlənir, atlar arpalanır, tonqal başında yığnaqlar dan üzünə kimi uzanır, qımız, buxsum, boza[51] bulaq kimi axır, ay işığında çocuqlar gizlənpaç, cəngili-məngili[52] oynayırdılar. Qoyun mələrtisi, camış oxrantısı, keçi bəyirtisi, dəvə hökkürtüsü, at kişnərtisi bir-birinə qarışırdı. Amma orda-burda sazlar-qopuzlar dinəndə, anlaşılmaz bir öyrəncə ilə bütün səslər kəsilirdi. Baxalım, nə söyləyirdi ocaqlar başında çalıb-oxuyanlar?

---

[51] Buxsum, boza — içki, araq

[52] Cəngli-məngli — uşaq oyunu

Bir ocaqda toplaşanlar savaş ərləriydi:

Kalxdı kızıl bayrak,
Güldü kara toprak,
Uçdu oxla mızrak
Səni anıb savaşdım.

Bir yığnaq ayrılıqdan danışırdı:

Neçin onla buluşdum,
Qucaqlaşıb kavuştum
Tüzünlügin kayıştım
Pozdu mənim yayımı.

Gizli tutdum sevgiyi,
Yandı bağrım kavruldu.
Bağlı tutdum gözümü,
Göz yaşlarım sovruldu.

Bir ocaq öyüd saçırdı:

Əldə qılınc varsa, Canalan da yemindi,
Kişi qara torpağa girsə, malı kimindi?

Gecələr beləcə mayımaq, yamaşmaq[53] bilmədən dan yerinə gəlirdi. Sonra yenə köç çatılırdı. Bəylər atlanır, ərlər bərgələnir[54], damar bərkilənir, gözçülər öndə yollanır, sular dağdan tökülüşür, qanad gərib dinləyən quşlar göydə sayraşır[55]. El ordadan qopur...

---

[53] Mayımaq, yamaşmaq — dincəlmək, ara vermək
[54] Bərgələnir — qurşanır
[55] Sayraşdı — qanad çala-çala oxumaq

Dağların Issık gölə enən ətəkləri milyon əllə boyanmışdı. Göl boyu daha iki gün getdilər. Beləcə Şorbulağ, Ağçay, Qızıltük, Ağterek, Qaratala, Qızılsu, Südlübulak, Daş quyu, Ağsu arxada qaldı. Köpüklü suları dağ başından ağarışaraq gölə tələsən iki çayın arasında, göl yaxasının enli bir yerində, Qara xanın bəyəndiyi Daşbulaq deyilən bir mənzərəli yerdə düşərgələrdəndilər. Bir neçə kərə burda yurdlanmış, sürülərini yamaclara sərdirərək dincəlmişdi. İlxılarını gölün sularına qovalatdırar, təmizlənmiş atlarının gün altında işım-işım işıldamasını görəndə bir könlü min olardı. İndi düşərgədə ayrı bir hava vardı. Xaqanın altunbaşlı çadırının sağında-solunda el bəyləri öz çadırlarını qurub, öz tuğlarını dikəltmişdilər. Bayraqlar qarışmışdı dağların çiçək dənizlərinə. Gölün sahilləri indiyədək belə şənlik görməmişdi. Yerli qaşqar, qırğız, uyğur bəyləri başlarının igidləri ilə adlı qonaqları ağırlamaq üçün sürü-sürü qoyun, at, dəvə gətirir, Qara xan başda, doğma ulusların bəylərini bir yerdə görüncə ürəkləri dağa dönur, onları qonaqlamaq adına öz yurdlarının da gücünü göstərir, çoxlarının yalnız adlarını eşitdikləri qan qardaşlarıyla görüşüb-buluşduqlarına görə yaradanlarına alqışlar söyləyirdilər. Axşamlar Qara xanın çadırına yığışsalar da gün boyu hərə öz tayfasının, uruğunun[56] arasında, iki bir, üç bir əylənirdilər.

Oğuz yaşıdlarıyla birgə gəncliklərinin ən gözəl günlərini yaşayırdılar. Atlarını göl yaxasında ötüşdürür, qılınc, qarğu, ox atmaq, qurşaq tutmaq yarışları ara vermirdi.

---

[56] Uruğ-turuğ — nəsil, tayfa, kök

Bu gün ova atlanmışdılar. Qırx igid başında Oğuz öncə ardıc kolluqlarından, sonra seyrək palıd, qayın, şam meşələrindən dikəlib, yalı aşdı. Qarlı dağ zirvələrinin görkəminə çıxdılar. Gözəlliyi ilə baxanı mat qoyan yerlərdi. Yarı-yoldaşı ov dalınca at qovdu. Oğuz da cüyür sürüsünün ardınca qoşarkən gözü sürünün pusqusunda durmuş, ox atıb vurmasa cüyürə ondan tez yetəcək qurdu gördü, at salıb qovdu, qayaya çıxıb oxladı. Özü yetməmiş yoldaşları yetdi. Qurdun dərisini boğazından çıxartdılar. Ov axşamadək uzansa da Oğuzun qarşısına başqa heyvan çıxmadı. Hərə öz ovunu tərkinə aldı, düşərgəyə döndülər. Cüyür, maral, quş, ov bütünlüklə xaqanlıq çadırının qarşısına qoyuldu. Qara xanla Güz xan qalxdılar:

- Baxalım, Oğuzun ovu nə olmuş?

Cüyürlərin, maralların, quşların yanında qurd dərisini görəndə Qara xan qaraldı:

- Boz qurdun ruhu bizi tutar, oğul, - dedi, - ona əl qaldırma!

Oğuz pozulmadı:

- Ormanlar boz qurtla doludur, baba! - dedi, - Ulusumuzu qurtarıb, bilirəm. Qurdbaşlı bayraqlarımız dünya boyu dalğalandı. Qutsaldır, elin sevimlisidir, sözüm yox. Di gəl, cüyürlərin tənini imsiləyən[57], qoyun dalınca yüyürən hər qurd müqəddəs sayılmaz. Artıb sürülərimizə, ilxılarımıza saldırırlar. Vurulmasa eldə mal qalmaz.

Xaqan oğlunun çəkilmədiyini görüb üstünə getmədi, yavaşca dedi:

---

[57] İmsiləyən — iyləyən

- O da payını-ürüşünü aparır. Sürünün bir qoyunu başının sadağası olsun onun! Doyacaq, gedəcək. “Qurd qonşusunu yeməz”, deyiblər. El gedər, törə getməz...

Oğuz qayğılandı:

- Ağzına sağlıq, baba! Sənin hər sözün mənə yarlıkdır[58]! Ancaq qurdun qutsallığı əski çağlarda qalmış. Bunu ozanlar belə söylər:

Gecə durub yürüyürdüm,
Qara, qızıl börü gördüm.
Qalın yayım kura qurdum
Məni görüb yalı aşdı.

Dədələrimiz də qurdu görəndə sadaxdan[59] ox alıb, yayı çəkmişdilər. Vurma dedin, vurmaram! Ancaq bütün yaradılmışlar bir-birinin yemidir.

Qara xan qurdun öldürülməsinin ona bədbəxtlik gətirəcəyini duydu. Oğlu elin xilaskarına, ümid yerinə əl qaldırmışdı... İçi yandı, amma yoldaşlarının yanında ona qıymadı:

- Vurmusan, bayrağımıza taxılar! Ancaq unutma, inancını tutmasan, el səni tutmaz!

Sonra danışığın bitdiyini bildirən bir ovqatla:

- Dincəlin, ertədən qalxmalıyıq, - dedi.

Üzə vurmadı, ancaq içində oğluna qızdı. Elin inancına qarşı getmək törə yasağıydı[60]. Qara xanın sözünü eşitməsə, babasına, anasına sayqısızlıq etsə nə vardı ki?

[58] Yarlık — əmr

[59] Sadax — ox qabı, oxluq

[60] Törə yasağı — qanunla qadağan

Güz xanla xaqanlıq çadırının qarşısına qayıtdılar. Oğluna qızdığını qardaşından gizlətmədi:

- Günümüz savaşda keçti. Övladlarımızın işi ox atmaq, qılınc çalmaq olduğundan törələrimizi unutdular.

- Anlatdın yanlış yapdığını!

- Başı yüyən görməmiş köhlənə bənzəyir... Yanaşarsan dalını çevirər. Bir az da dirəşsən nalını alnının ortasına yapışdırar. Boğazı örkən atıb, boğub asta-asta öyrədəcəksən.

- Anası bacarar bu işi!

- Yox, o yaşı deyil. Ana qucağından çoxdan sıyrıldı. Axtarıb başqa bir yol tapmalıyıq.

Susdu, sonra nə düşündüsə, qardaşının əlindən tutub əlavə elədi:

- Gələnəklərdən qopa bilmərik. Ürəyimdə bir diləyim var. Səndən asılıdır. Xaqan da olsam, qardaşım da olsan qapına gəlməliyəm. Oğul da sənindir, qız da. Banunu ver Oğuza, adaxlayaq, bir az da yavuqlaşaq, toylarını edək, başı qarışsın. Onun ipini Banu yığar. Qızını inanclı, inadcıl böyütdün, bilirəm.

Güz xan sözün belə dönəcəyini gözləmirdi. Öncə çaşdı, üzə vurmasa da, böyük qardaşının onun qızına elçi düşməsinə sevindi. Onsuz da kim elçi düşsə, Banunu böyük qardaşı verəcəkdi. Ailələrinin başdan gələn adəti, gələnəyi beləydi. Böyük qardaş olan yerdə kiçiklər öz qızlarının elçilərinə “hə, yox” deyə bilməzdilər. Əmisi Oğuzu bəyənirdi. Oğuzun başqa yaşıdlarına bənzəmədiyini o da hiss eləmişdi; gündə bir arpa böyüyür, eldə-obada ağılda, cəsarətdə, igidlikdə tayı-bərabəri olmayan alp ərəndir. Qolunun gücünə görə qarşısına keçən tapılmaz. Ən yaxşı ustadlardan, alimlərdən

dərs alıb. Üzündəki dan işığına bənzər təmizlik onu da qanadlandırır. Böyük qardaşının yerini Oğuz kimi yetkin bir varisin tutacağına sevinir, ayağının düşərli olacağını bilirdi. Banu da "yox" deməyəcəkdi. Bir il öncə qarşılarına çıxan bir Tanqut baxıcısının sözlərini indiyədək unutmamışdı. Baxıcı demişdi:

- Evinizə gün düşüb, bir savçı, yalavac[61] doğulub, duymamısınız. Bayrağınızı göylərə çəkəcək, başınızı ucaldacaq.

Güz xanın dalağı sancmışdı. Hansı baxıcıdan, caduçudan sordusa, bu sözləri dedilər. Gizlicə göz qoyub, doğrudan-doğruya qardaşı oğlunun başqalarına bənzəmədiyini, yaşına uyğun gəlmyən dərəcədə ağıllı, tədbirli, yol-iz bilən olduğunu, sözüylə dinləyənləri ovsunladığını görmüşdü. Seçilmişliyinə şübhəsi qalmamışdı. Baxıcı deyənlərə yalnız o uyğundu. Yaradanların savçılığı yalnız ona yaraşırdı. Ürəyi yerinə gəlmişdi. Banuya ondan gözəl adaxlı hardan tapılacaqdı?

- Elimizin də, evimizin də böyüyü, ağabəyimiz sənsən, - dedi. - Banu qaravaşı olsun Oğuzun. Bələkdən bir çadırda yatıb, bir dəvənin belində yüyürüşüblər. Çocuqluqları bir keçib.

Qara xan güldü:

- Bu, alın yazısıdır! İkisi də bizimdir.

Orda düşərgələnəndə, gecələr, elə bil, ulduzları salxım-salxım qoparıb yerə səpələyirdilər. Ocaqlar işıq-işığa, oxuyanlar səs-səsə... Hər boyun öz çalğısı, öz nəğməsi vardı. Bu səslərlə hansı obanın hara düşdüyünü sezmək olardı. Qurd ulartısından at

---

61 Yalavac — peyğəmbər, Allahın elçisi

kişnəməsinə, göy gurultusunadək yer üzünün bütün səsləri qaynayıb-qarışıb köçün böyük hayqırtısına çevrilmişdi. Gözünü yumub dinləsən, bu oxumalarda ulduzların sevgi pıçıltısını, işığın aydınlıq dilini, uzaq minilliklərin açar gizlinlərini duyardın. Quzeydən gələnlərin ana maraltək boğazda qaynatdığı mələrtiyə Altay qartallarının qıy səsi, çöllərin sonsuz acıyla dolu qat-qat iniltisi, güneylilərin çınqıllıqla çapan at ayaqlarını andıran saz cingiltisi qarışırdı. Simli qopuzlar ürəyə köklənirsə, ağız qopuzu kimsəsiz yaylaların otunu-çiçəyini dilləndirən erkən dan yellərinə köklənir. Hansı ocaqdansa qurd ulayışına bənzər bir səs yüksəlirdi:

İstəyin qoyun olsun,
Boğazla toyun olsun,
Boz börü, hu!
Qarındaşım, hu! İnaqım, hu!
Çağır məni yer üzünün sonuna.

Qılıncım, qarğım,
Qanadım, yarağım,
Ağ atım, hu!
Qır atım, hu!
Apar məni yer üzünün sonuna.

Altın yayımdan uçan,
Qara dəmirdən keçən,
Ötkün okum, hu!
Yetkin okum, hu!
Uçur məni yer üzünün sonuna!

Başqa bir səs yaşam sevgisiylə dolu tox və ötkəmdi:

Atımı dağa vurdum,
Dağ mənə keçid verdi.
Atımı çaya sürdüm
Çay mənə içət verdi.
Atımı yurda sürdüm,
Sən də ver payımı, qız!

Gölün qırağındakı bir ocaqda ozan bitməz bir sevgiylə yaranışdan türkün arxası, tapınağı olmuş dağları soylayırdı:

Bəylər qonaq gəldi sənə
Öyün, dağlar! Öyün, dağlar!
Ozan ələ qopuz alsın,
Kəsilməsin toyun, dağlar!
At oyatsın yollarını,
Yaz donatsın çöllərini
Bun[62] pozmasın ellərini
Gülsün oban, köyün, dağlar!
Orda gədiklər qardadı,
Burda bağçalar bardadı,
Sorsalar, cənnət hardadı?
Deyin: dağlar! Deyin: dağlar!

Gecə bəylər açıq havada, gölün qırağında xalı-xalçanın üstündə yeyib-içib şənləndilər. Göydə ay ay-

[62] Bun — dərd, qəm, kədər

lanmışdı. Göz önündə sonu görünməyən bir gümüş dənizi dalğalanırdı. Ertədən yola çıxacaqlarını bilən yeniyetmələr ilin bu çağında gecələr də isti olan sudan doymayıbcasına atlarını gölə vurmuşdular. Göldən çıxanı sudan doğulurdu elə bil.

...Yenə neçə gün yol getdilər. Bu, çağlar boyu gördükləri köçlərdən deyildi, savaşsız, itkisiz yazın dincliyindən doğan bir xoşbəxtlikdi. Bir də yaşana bilərmi belə bir yolçuluq? Kim bilir? Çal-çağırı, ovu, yarışı, yürüşüylə bir kişinin on ildən bir görə biləcəyi, ya da görə bilməyəcəyi bənzərsiz günlərdi.

Türkün ulu tapınağına gedən böyük elat Ala beldən aşanda, bir anda hamını heyrət bürüdü. Onlar təbiətin sözəgəlməyən, təsviri mümkün olmayan bir möcüzəsiylə üz-üzəydilər. İndiyədək ətəklərindən keçib-gəldikdəri, hər birinrin öz gözəlliyi olan qosqocaman dağların ən gözəli, ən ucası olan Tanrı dağı nəhəng bir ox ucu kimi buludları deşib göyə sancılmışdı. Köç Sarıcaq yaxasıyla enib Tanrının şırım-şırım yamaclarıyla üzü yuxarı dikəldi. Yol onları dağın dünya yaranandan bəri qarı-buzu əskilməmiş zirvələrinə doğru dikəldirdi, ancaq qəfildən keçilməz qayalara dirəndilər. Qara xan ilk dəfə gələn və bu yerləri bilməyənlərə anlatdı:

- Qayalar yol verəcək, qorxmayın. Bu çay hardan gəlir bəs?

Suyu tutub irəlilədilər. Bundan belə əl içi kimi dümdüz çay yatağı özü yoldu. Qayaların arasından, dərinlikdən axıb gələn su çınqıllıqda yayılıb keçidə dönmüşdü. Qayalar baş üstündə çəmbərlənib bitişmişdi. Ancaq hardansa işıq süzülür, at dırnaqlarından

qalxan su damlaları bu işıqda yalab-yalab[63] yanır, çınqıllıq daş-qaş ağuluğuna oxşayırdı. Minlərlə at ayağından qopan səs kimsənin eşitmədiyi, adamın içinə işləyən bir çalğıydı. Keçid öncə daraldı, azca keçmiş genişlənib işıqlandı, sonra da qarşılarında bir ucu dağların qarlı başına dirənən, hər yandan keçilməz qayalarla, dağ düzümləriylə qorunan, görünür, bu koğuşdan başqa yolu olmayan bir genişlik, meşəli yamacları, irmaqlı dərələri, ata boy verməyən çəmənləriylə düzədüz bir uçmaq yerini, cənnəti andıran bir vadi, o vaxtlar deyilən kimi sızra[64] açıldı.

Qara xan atının belində dikəldi:

- Oxqay! Gözəl Ərkon, yenə görüşdük, - deyib atının başını buraxdı.

Bələdçilərin, gözçülərin öndə getməsi kimi türk ordu törəsi, köçün pozulmaz düzülüşü unudulmuşdu. Görünür, ordu başçıları, ərlər buna öyrəncəliydilər. Aralanıb yol verdilər ona. Xaqan dölək atını səyridib önə keçdi və tanış yolla irəliyə doğru çapdı. Dərənin ortasında Yeddibulağın yan-yana qaynadığı yerdə əli qalxdı:

- Burda yurdlanacayıq, bəylər! Ərlər qonsun Ərkona. Türk dağlarının hər birinin bir ərki, Ərkonu var; bu dərə yalnız bizim üzümüzə açıqdır. Köç burda dincələcək. El bəylərisə Ata ünürə gedəcək...

Ertəsi gün ordadan ayrılan ulus başçılarının atları süd kimi dağın döşündən süzülən balaca çayı tutub getdilər. Suların əriməz buz laylarının altından qaynadığı yerdən güneyə dönüb yenə qayalar arasıyla burula-bu-

---

[63] Yalab-yalab — par-par

[64] Sızra — vadi

rula irəlilədilər. Bir gün öncə keçdikləri koğuşa bənzər, ancaq bir atlının yerləşə biləcəyi oyuğun önündə atdan endilər. Cilovları arxadan gələn atabaxanlara verdilər. Dəfələrlə gəldiyi yerdə Qara xan yenə ilk gəlişindəkitək duyğuluydu. Ürəyi köksünə sığmırdı. Buranı görməyən qonaqlarsa çaşqınlıq içindəydilər. İndi onlar elin müqəddəs ziyarətgahına girəcəkdilər. Hər birinin çocuqluqdan eşidib-duyduğu Ata mağara - ulusun beşiyi buraymış. Bu yerin sonadək açılmayan gizlinləri, sirləri hər bir türk kişisinin ürəyində yaşayır, onunla birgə yer üzünün dörd yanına yayılır... Bura başlanğıcdır, son da ola bilər. Qara xan:

- Boz börü[65] bizi bu ünürdə bəsləməyib, yox! Ata ünür deyəndə bütün bu çay boyu sızranı, keçidin üstündə, dünəndən bəri gördüklərimizi düşünüblər. Boz börü altından keçdiyimiz qayalardan yol açıb. Baxın! Bu geniş sızrada neçə min kişi yaşaya bilər? Burda soraqsız, qorxusuz, kimsəyə duydurmadan yüz il də keçinmək olar. Bura nə qədər böyük olsa da bir ev kimi qapalıdır. Tanrıların evidir, tanrısevərlərin beşiyi, türk ulusunun yaradanlarla görüş yeridir bura!..

Bəylərin əlləri qalxdı. Qurd ulartısına bənzər bir səs qayalarda dalğalanıb çox-çox uzaqlara yayıldı. Səsə öndə Qam Ata, ardınca orta yaşlı qamlar mağaradan çıxıb qonaqların önündə bağır basdılar.

Ata mağarada çoxdan bəri bunca adlı-sanlı qonaq olmamışdı. Öndə gedən qamların ardınca geniş bir daş otağa girdilər. Yan-yörə, alt-üst divarlar əllə yonulmuş təki sığallıydı. Girişdən axan işıqda mağaranın alaçıq

---

[65] Boz börü — boz qurd

banı kimi yumru qübbəsi ayıdın görünürdü. Sol əldə damcı bulağın suyu daşda balaca gölməçə yaratmışdı. Su elə qayanın altındaca süzülüb itirdi.

Hara baxırdınsa qurd, maral, təkə uyuqları[66] düzülmüşdü. Burda, yerindəcə ünürün öz daşlarından yonulmuşları da vardı. Uyuqların bir neçəsi eləcə içi mamırla doldurulmuş dərilərdi. Bəylər otağı dolandıqca bağır basıb, qütsal bütlərə alqış söyləyir, dua edirdilər. Birinci otağı dolaşandan sonra yuxarı başdakı yarıqdan ikinci otağa keçdilər. Mağaranın dərinliyində qonaqların danışıqları da qurd ulartısına bənzəyirdu. Gördüklərinin təsiri altında duyğulanmış bəylər özləri də ulayırdılarmı? Qara xanı qarşılayan, yanınca dolaşan, özü də bir qaya parçasına bənzəyən ayağı çizməli[67], çiyni kəpənəkli[68], şiş börklü mağara bəkçisi Qam Ata qonaqlara Ata mağaranın elin ziyarətgahına çevrilməsinin köklərindən danışırdı. Bura təkcə bütlərin saxlandığı yer deyildi, həm də bir bilgi[69] xəzinəsiydi. Türk yaradıcılarının tanrısal işlərinin izlərini saxlayırdı. Bunu hər kəs bilirdi. Qam Atanın səsi min illərin o üzündən gəlirmişcəsinə təsirli və çəkiciydi:

- Bu ünür Tanrılarla atalarımızın qutsal anılarının, ruhlarının birgə, yan-yana yaşadığı, qonşu olduqları yerdir.

Hardansa işıq yol tapıb içəri süzülürdü, sehirli, ay işığına bənzər cazibəli bir aydınlıq vardı burda, bu

---

[66] Uyuq — bostanlarda qoyulan quşqorxudana deyilir. Burda büt anlamındadır

[67] Çizmə —çəkmə, ayaqqabı

[68] Kərənək —kişi geyimi

[69] Bilgi —bilik

işıq qayaları necə deşirdi, hardan yol tapırdı özünə, bilinmirdi. Mağaranın daş divarları, gümbəzi dəmir kimi qızarırdı.

Qam Ata onları üçüncü-dördüncü otaqlara apardı. Otaqdan otağa keçidlər şaxəli dolanbaclara oxşayırdı; öndə Qam Ata olmasa, qonaqlar bu dolanbaclarda çaşıb qalardılar. İç otaqlar daha böyükdü. Əllərində yağ çıraqları tutmuş, özləri də çıraq adlanan yardımçılar divarlar boyu düzülüb otaqları işıqlandırırdılar. Qonaqlardan gözləmədikləri bir görüntüylə üz-üzə gəldiklərindən çaşıb qalmışdılar. Üstünə minlərcə işılda quş qonmuş kimi, içdən ulduz-ulduz yanıb parıldayan qranit qaya yaradanın istəyi ilə, ya da əllə oyulub yumru bir ürəyə bənzədilmişdi. Burda yaşı bilinməyən çağlarda çəkilmiş görünüşlər, yazılar, üstdən aşağı bütün divarı tutmuşdu. Qara xan bütlər-çələblər ağuluğu adlansa da ulusun böyük yaradıcılıq gücünü göstərən, keçmişin sehirli izlərini, yazılarını qoruyan, buna görə də doğrudan-doğruya qutsal olan, əsl tanrılıq[70] yeri olan bu mağara şəhərciyini qonaqlarına, içinə sığmayan bir sevinclə göstərirdi. İlk öncə Oğuzun görməsini istəyirdi. Burda duyduqlarının, ataların ulu ruhlarının onu yanlış yoldan qoparacağına, babasının inancının böyüklüyünə baş əyəcəyinə, ola bilsin, dönərkən ona yanaşıb “boynum qıldan incə, başımdan böyük danışmışam” deyərək könlünü alacağına inanırdı. Ancaq Oğuzun üzü öz işıqlı çevrəsi ilə nə düşündüyünü gizlədirdi.

---

[70] Tanrılıq — İlahi, müqəddəs

Qam Ata bələdçiliyini sürdürürdü:

- Bunlar uruq-turuqumuzun sonsuz bilgisinin ən ulu örnəkləri, elin müqəddəs daş kitabları, sonsuzadək yaşayacaq bitiklərdir[71]. Böyük keçmişdə yalnız Göy elçilərinin və qamların anladığı - İnsan oğlunun ortaq anlaşma dili olan, müqəddəs Senzar* (dilində yazılanları da var, bügunku dilimizdə yazılanları da. Ən önəmli olan budun[72] ağacımızdır. Bu ağacda elimizin-günümüzün, ulusumuzun kökü, qol-qanadı, yolu, boy ayrıntıları göstərilir. Yanında yer üzünün cizgisidir. Tanrıların bizə verdiyi yerlər, sular, dağlar, yollar çəkilib. Kökümüzü, yurdumuzu unutmayaq deyə... Baxın, nə yazılıb burda?

Qara xan dikəldi. Sanki uzun yolları yalnız bu sözləri dinləmək üçün keçmişdi: "Türk xaqanı Yer-Su yiyəsiz qalmasın deyə göndərildi. Bu yerlər-sular ancaq Türk xaqanlarının əlində olmalıydı. Türklərin atalarının da yerləri, sularıydılar."

Gözlər Qam Ataya dikilmişdi. İndi onun səsi göydən gəlirmişcəsinə ürəklərə işləyirdi:

- Elimizin, törəmizin düzənini saxlayan yazılardı bunlar. Bunları unudarsaq, uluları, onların ruhlarını unudarıq. Ata ünürün sayı bilinməyən otaqlarındakı sayı bilinməyən bitiklər, bəlgələr bizə bundan yana dəyərlidir.

Bu yerdə Qam Ata nə isə düşünüb susdu, sonra gözünü Qara xana dikərək, yavaşca əlavə etdi.

---

[71] Kutsal bitiklər — Müqəddəs kitablar

* (Bir ehtimala görə yer üzündə öncə yalnız bir dil, yaradanın və onun peyğəmbərlərinin dili olub, bu rəmzlər dilini yalnız əski kahinlər bilirmişlər. Onların məhbiylə bu dil də unudulub.

[72] Budun — millət

- Yer üzünün ilk yazı cizgilərini də onlar yaratmışdı. O cizgilər bizim izlərimizdir. Günçıxandan günbatana, bütün bildiyimiz torpaqlara yayılıb...

O yazıların ən əskiləri də burdadır.

Ata mağaranın dəyərini, Atasının bura olan bağlılığının nədən qaynaqlandığını Oğuz indi anlamışdı. Başqa səslər olmasa ürəyinin çırpıntısı, damarının atması eşidilərdi. "Tanrının birliyini, böyüklüyünü bir daha gördüm, - deyə düşünürdü. - Bu bütlər, uyuqlar oyuncaqdan başqa bir şey deyildir. Yeri-göyü yaradan Tanrıdır. Ey tapdığım, sevdiyim, öydüyüm uca Tanrım, sən babamın qara könlünü işıqla doldur. Yola gəlibən məni duysun! Yeri uçmaq olsun. Babamla aramızdakı bu ayrılığı, Ulu Tanrım, sən çöz. Ağ alnı qırışmasın. Ürəyinə pis düşüncələr sızmasın. Mənə qızmasın, dəvə kimi kükrəməsin. Bu sələblər tələsindən qurtarsın! Bu yonma ağac oyuncaqları, bu soyulma dəri uyuqları, yoğurma palçıq burxanları tenqri deyib oxşamasın. Onların ruhlarının varlığına inanmasın! Sənə yorulmadan yükünc yükünərəm[73], Tanrım! Ucalardan ucasan! Sən anadan doğmadın! Sən atadan olmadın! Kimsənin payını yemədin. Kimsəyə güc etmədin. Götürdüyünü göyə yetirən, görklü Tanrım! Dediyinə sığındım. Bir olan, bəlli Tanrım!"

Ata mağara Oğuzun fikrini dəyişməkdənsə onu el bəylərindən qoparmışdı. İndi o üzü Tanrıyaydı. Onunla danışır, onu eşidirdi. Tək olan Tanrının savcısı, gücü, qılıncı kimi ortaya çıxmağın qaçılmaz olduğunu duyurdu. Bu duyğu üzünə vururdu.

---

[73] Yükünc yükünmək — Dua etmək, alqış söyləmək, yalvarmaq

Qara xan oğlunun çöhrəsinin işıqlandığını gördü. Qaranlıqda Oğuzun gözləri çıraq kimi yanırdı. Bəylər də sezməmiş deyildilər. Bu işığın tapınağın təsiriylə deyil, Oğuzun içdən duyğulanması, başqa bir havadan körüklənməsiylə bağlı olduğunu anlayanlar da vardı...

Qam Atanın bələdçiliyi sona varırdı:

- Atalarımız dəmiri burda bulub, burda əritmiş, yer üzünə burdan yaymışlar. Çinin İpək yolu deyilən Türkün dəmir yoludur, öncə burdan başlanıb...

Ata mağarayla tanışlıq başa çatandan sonra onqonların yığıldığı iri otaqların birində bu yapma çələbilərə, ataların, Türk böyüklərinin ruhlarına dua oxudular. Səs mağaranın daş bətnini davul kimi çalır, gumul-gumul gumuldayır, burdan bütün sızraya -vadiyə yayılırdı. Bu anda yurd salıb ocaq çatan köç də Yeddi bulaqda hər zaman yanlarında daşıdıqları tözlər qarşısında yalvarışdaydılar:

- Ulu çələbilər budunumuza yar olsun, ulusu qorusun. Yolundan sapanı yola gətirsin. Düz olanı görməyənin gözünə işıq versin.

Ey atalarımız, bizi eşidin! Bizə bir ovuc dən verdiniz, onu yer üzünə səpdik. Bir damlaydıq, bir dəniz olduq!

Adınızı, varlığınızı yer üzünə tanıtdıq. Ata adını, ana öyüdünü uca tutduq.

Yurdumuzu iduk[74] yapdıq! Yerlərin - suların tək bəyi olduq!

Nerəyə vardıqsa düzlük apardıq!

---

[74] İduk — müqəddəs

Əyilməyən başları əydik, bükülməyən qolları bükdük!

Sevinin, bizi də sevindirin!

Bizə və yurdumuza yardımçı olun!

Ata mağaradan geri dönərkən işıqlığa çıxdıqları ilk anda Ərkon bütün görkü - gözəlliyiylə gözləri önündəydi. Qarlı dağlar dörd yandan çevrələnib Ərkonu ovcuna almışdı. Sızra gün işığıyla, qar işığıyla, Ata ünürdən axan bilgilərin, gizlinlərin işığıyla, el birliyindən doğan gücün, Tapıq bayramının işığıyla doluydu .

Ata mağaradan baxanda aşağıda, bulaq başında, kiçik dağ çayları boyu düşən böyük yurd və burdan dərənin çıxışına, sızranın ağzına aparan araba yolu aydın seçilirdi.

* * *

Qara xanın altun başlı ağ çadırı Ərkon sızrasının tam ortasında, Yeddibulağın başında qurulmuşdu. Ərkonu qoruyan, burda sürülərini artırıb, oğullarını böyüdən sızralıların böyükləri toplanıb gəldilər. Uzun saçları kürəklərini döyəcləsə də saqqalsızdılar. Şölənə yüzlərlə kişi toplanmışdı. Qurban bayramı elin-ulusun gözlədiyi, hər kəsin bir dilək, bir umudla bağlı olduğu bayramdı. Bayatların, ataların adına kəsilən qurbanların eli, bircə addım da olsa, öz istəyinə yaxınlaşdıracağına, şərin, pisliklərin yolunu bağlayacağına, dinclik tapıb qansız-qadasız yaşamalarına yardım edəcəyinə inanırdılar. Bu bayram həm də güc, ərənlik sınağıydı, hər il elin yeni alpla-

rını ortaya çıxararaq tanıtdırırdı. Ən önəmli olan bu bayramın barış gücüydü. Burdan ayrılıb gedənlər içlərində el-ulus birliyinin onurunu aparırdılar. İnciyib gedənlər, burda başlanan söz-söhbətləri düşmənliyə çevirənlər də olurdu.

Törəyə görə şölən at səyirdisindən başlanırdı. Bu yarışlar yenəni, yeniləni aydınlaşdırmaqla yanaşı, elliyin gücünü, ərənlərin savaş ustalığını göstərir, yarışanları bir-birinə daha da yaxınlaşdırırdı.

Oğuzun ötən bayramdan bəri bir boy da böyüdüyünü, yaşıdlarının başı, istəklisi olduğunu hər kəs görürdü.

Sızrada kəsiləcək ilk qurbanlıq üçün at saldılar. Düşərgədən çox da uzaq olmayan, gömgöy yosunla örtülmüş qayaların arasında, adama boy verməyən çəmənlikdə keyik sürüsünü tapmaq o qədər də çətin olmadı. Burda da ilk ov Oğuzun qismətiymiş. Önəmli olan da bu idi. Neçə ov vurulur-vurulsun, bəylərin gözlədiyi birinciydi. İlk ov bütün el bəyləri arasında paylanırdı. Bu ovdan qardaş boyların saraya toplaşan başçılarının hər birinə kiçik də olsa bir qismət çatmalıydı. Sonra yüzlərlə heyvan kəsiləcəkdi, ancaq qurbanlıq ovdan bir tikə yeməyən el başçısı yan-yörəsini də çəkib gedərdi. Ov əti paylanandan sonra dağın Güney yamacında üzü günəşə at, qoyun qurbanları kəsilərdi. Bundan sonra andiçmə mərasimi başlanacaqdı. Bəylər qılınclarını ani olaraq biləklərinə çəkəcəq, tək-tək ortadakı iri sağraqa[75] yanaşacaq, al-qırmızı içkiyə hər alpın çərtilmiş qolundan bir-iki damla qan düşəcəkdi. Sonra

[75] Sağraq — içki qabı

qanlarının qarışdığı bu içkidən sırayla hərə bir qurtum içib, əllərindəki qılıncı şahid - tansuk[76] tutaraq el birliyini qoruyacaqlarına, törəyə, ocağa, yurda bağlı olacaqlarına yəmin edərək[77] bayram andını - şərabı içəcəkdilər.

Ocaq törəsi, o zamanlar tin deyilən ulu ruhlara, tanrılara dualar gün boyu uzanırdı. Kişilər yalvarquya[78] duraraq, yüküncləri, yalvarışları bitirib sonra yeməyə toplaşardılar. Yeddibulaqdan azca aralıda ilxılar, sürülər üçün ayrıca qurban kəsilmə yeri, daha doğrusu at tapınağı da vardı. İlxıçılar, çobanlar, sığırtmaclar[79] da orda öz qurbanlarını kəsirdilər.

Gündoğan türkəş ulusununun başçısı, adı tabqaçın qara bağrını yaran, azman bədənli, bığları qulaqlarında düyünlənmiş Gündüz bəy toy başqanı seçildi. O altun ayağı Qara xana verdi. Qara xan dedi:

- Bəy qarındaşlarım, ulus böyükləri! Ulu bayatlar qurbanlarımıza bağışlasın bizi, yurdlarımızı qorusun. Göy çadırımız, yer düşərgəmiz oldu. Gündoğan - Günbatan arasında ayağımız dəyməyən torpaq qalmadı. Ancaq kökümüzü unutmadıq. Bilgi, bitik[80] sahibi olduq. Yürüşlərdə, savaşlarda ilkin yollarımızı itirmədik. Yazıda yaşamaq bizi burdakı ana yazılarımızdan qoparmadı. Bunun üçün də bu törənə toplaşdıq. Aylarla keçiləsi yolların o başında, ulaşılması çətin olan uzağlıqlarda yaşasaq da,

---

[76] Tansuk — şahid
[77] Yəmin etmək — and içmək
[78] Yalvarqu — dua oxunuşu
[79] Sığırtmac — qaramal otaran, naxırçı
[80] Bilgi, bitik — bilik, kitab

birik. Dünya bəyliyi alın yazımızdır. Az-az görüşməyimiz ayrıntılar yaradır. Ancaq bir elik, bir qanın, bir dilin, bir törənin çocuğlarıyıq. Bir kişinin belindən gəlmişik. Birliyimiz pozulsa, günçıxanın, günbatanın adını eşitmədiyimiz yabançı ellərinin qoşunları bizi çeynər. Birliyimiz pozulmasın! Bayatlar bizi qorusun!

Ortada təpələnən qoyun, dəvə əti uzanan əllərin altında əridi. Qımız tuluqları boşaldı. Toy bəyi gülümsəyərək dedi:

- Qardaşlar, Çin xaqanı qızını veribən məni tovlamaq istəyir. Bağlaşaq, Çin ordusunun başında dayansın deyir, quzeydən çölün arasıkəsilməyən, gözlənilməz, urğun[81] akınları dayansın, ildə yüz min yalab-yalab yanan, gözəl ipək parça, pambıq, kətan, bez, pirinç verək, savaş bitsin, deyir.

Bəylər baxışdı. Səssizliyi Qara xanın göy gurultusuna bənzər gülüşü pozdu:

- İgid Koroğlunun könlünə Çin kızı düşüb, bəylər!

Kimsə söz atdı:

- Çin gözəli kimin könlündən keçmir ki?

Uyğur xanı Alıncı oğlu Alpdoğan söylədi:

- Onlar ev pişikləridir. Yazıda[82] soluxub itirlər. Türk qızlarının yükünü çəkə bilməzlər. Bizə dözən özümüzkülərdi...

Gündüz bəy şuxluğunu pozmadı:

- Qarışdırmayın, bəylər! Tabqaçı Çinə zorla bağlamayaq. Bizdən qopub gedənlərdir.

Altaylı Bögü xan oğlu Ənik acı-acı gülümsədi:

---

[81] Urğun — yağmaçı

[82] Yazı — çöl, düzəngah, səhra

- Tabqaçın Çinə qarışacağı yoxdur, düzdür. Bizdən qopub gedənlərdir, bu da düzdür. Ancaq onları çinlidən ayıran nədir? Anladarsanmı bizə? Onlar çinlini dəyişdirib bizə yaxınlaşdırmaqdansa, bizi Çinə yamamağa çalışırlar. Bizdən qopub bizə arxa çevirənlər çinlidən daha qatı yağı olur. Təkcə həyatları yox, ürəkləri də dəyişildi onların. Nə biz kimi bizdəndilər, nə çinli təkin Çindən. Aranı kəsməsələr bu savaş bitmiş olardı.

Qara xan hələ də doyum-doyum[83] gülürdü:

- Xanımdan qorxmursanmı?

- Xanım nə deyəcək? "Ulusuma gərəkirsə, beş çin qızını birdən al" deyir.

- Uğurlu olsun, bəy! Toylan, bağlan! Bəlkə tabqaçların donmuş qanlarını sən diriltdin.

Yenə gülüşdülər. Bu sözlərin ciddi, ya şuxluq üçün deyildiyini kimsə sormadı.

Ancaq Koroğlu tutmuşdu:

- Çin qonşuluğuyla bayatlar bizi sınağa çəkir, bəylər, - dedi. - Bunca verək[84] yerlərdə yaşayasan da, bu qədər kiçik ürəkli, qafasız olasan, ağlasığmazdır. Erkəyini-dişisini ayırmaq olmur. Biz keyik, quş ovçusuyuq, onlar yaranqu, insan ovçusu. Biz tapığı heyvanlardan kəsirik, onlar kişilərdən. Tanrıları da öz törətdiyi insanın qanına susayır.[85] Üstəlik quşların da ən yırtıcısını Tanrı oğlu sayırlar. Onlara da tapıq kəsirlər.

Qara xan çadırını, yemək-içmək ünürlərini ərkonlulara yağmalatdı. Yüngülləşdi. Ata mağara gördü-

---

[83] Doyum-doyum — məmnun-məmnun

[84] Verək — məhsul verən, törədən

[85] Əski Çində tanrılara insan qurbanı vermək adətinə işarədir

sü[86] sona vardı. Günəşin altında cilvələnən Ərkonun başına dolanmış dağlara, çay yaxalarındakı ormanlara, yamaclarda iki bir-üç bir, göbələktək ağaran alaçıqlara son kərə göz yetirərək, onları ağırlamağa gəlmiş ərkonluları bayatlara ismarlayıb yola düzəldi. Gəlinən yol gedilməliydi, ancaq yox, gəlinən yolla dönmədilər. Bu kəs yolun kəsəsini seçdilər. Issığın gündoğanından adlayıb Uyğurlardan gələn el yoluna, arğışları-karvanları gündoğandan-günbatana, günbatandan-gündoğana daşıyan ünlü İpək, yaxud Türk yoluna çıxdılar. Gölün quzeyində meşəli dağların ətəyiylə iki gündə otuz iki dağ çayı adladılar. Yol işlək olduğundan çaylar körpülənmişdi. Hər birini hansı bəyin hansı çağda qurdurduğu da bəlliydi. Özləri köçsələr də, yolçuya keçid verən körpülərdə adları yaşayırdı. Gölün quzey çevrəsi daha yaşıldı, daha görklü, geniş, axar-baxarlıdı. Köpüklənə-köpüklənə gölə tələsən balaca, ancaq iti, daşqın çayların hansını tutub getsən gözünün önündə ilan boğazından çıxmış kimi düpbədüz şam ağaclarının qarlı təpələrə doğru dikəldiyini görər, ormanların səssizliyinə dalarsan. Bir az da dikəlsən bu ormanları ardıc, çaytikanı pöhrəlikləri əvəzləyəcək. İndi obaların o kolluqlardan yuxarıda, adama boy verməyən çəmənliklərdə, bu çayların qar altından qaynayıb qalxdığı yerlərdə yaylayan vaxtıydı... Doğrudan-doğruya tanrısal, ilahi gözəlliyi olan yerlərdi. Çu çayının dərənin sıxıntısıdan çıxıb Alataunun ətəklərinə yayıldığı yerdə köç dayandı. Bura yol ayrıcıydı. Qara xan bir-neçə gün buralarda dincələcəkdi.

---

[86] Ata mağara gördüsü — burda Ata mağara ziyarəti anlamında

El bəyləri, başında alplar-ərənlər, hərə ayrılıb öz yoluna- yurduna sapdıqca[87], Oğuzun ürəyi indiyədək duymadığı bir acıyla[88] dolurdu.

Qara xan yurd yerlərində dincələ-dincələ son bahara - güzə doğru Sığnağa[89] dönüb yaylaqdan qayıtmış ulusa qatıldı. Güzlə qışı burda keçirəcək, sonra aranı tez-tez qarışdıran, uyğusu qarışantək elçi göndərib Yağmur daşını istəyən Başqurd xanının üstünə yürüyəcəkdi. "Çin xaqanı bu daşın quyruğundadır. Onu anlayıram. Quraqlıqdan qaçmaq, yağmur yağdırmaq istəyir. Başqurd elinədəmi gəldi quraqlıq? İl uzunu başınıza tökülən yağmur deyilmi sizin?"

Elçi halını pozmadan dilləndi: "Mənim xanım deyir ki, o daş yağmuru yağdırır da, dayandırır da."

Sözsüz, işin kökündə daşa bəslənən ümidlərin dayandığını hər kəs bilirdi. Daşı ovcünda tutanı yer üzünü tutmuş bilin. Bunu düşünürdü Başqurd xanı. Qara xan da bundan xəbərdardı.

Çu, İnci suları boyunca, Qoşaçay arasında min illər boyu atalarının olmuş, indi miras olaraq ona qalmış, elini yedirib doyuran əkin-biçin yerlərinə varacaqdı. Yurdu savaşdan qorumaq boyun borcuydu. Bu verimli-bərəkətli torpaqlarında doyunca otura bilməmişdi. Tarlalarını əkinçilərə, qul-qaravaşlarına, qoca-qarıya verib əkdirib-biçdirir, qışda satılacağını satır, yeyəcəyini yeyir, ulusa bölür, satışdan gələn altunu ağuluğa, malqaranı sürülərinə qatırdı. Son bahar adaxlıların günləri sayaraq bəklədikləri, toylanmaq, düyünlənmək, evlənmək çağıydı...

---

[87] Sapmaq — dönmək, dəyişmək

[88] Acı — ağrı, əziyyət

[89] Sığnaq — Mərkəzi Asiyada Oğuzların baş kəndi

## YUXU

Oğuz, Ata mağaradan dönüncə Uslu Xocanı tapdı.

- Atabəyim, Ata ünürü gördünmü?

- Gördüm, övladım!

- O palçıq çələbləri, içinə ot-ələf təpilmiş sığır, dağ keçisi dərlərini, qoxumuş uyuqları[90], yılan, tısbağa "bayatlarımızı" da gördünmü?

- Gördüm!

Oğuzun nə demək istədiyi bəlli deyildi. Ancaq Uslu Xoca yetirməsinin gec-tez sözü dolandırıb öz sağıncına[91], məqsədinə gətirəcəyini bilirdi:

- Gördün, ancaq "Bunlar yabanı[92], yetişməmiş kişilərin sırımasıdır, ulusumuza yaraşmaz, bizim yaradanımız yer altına sığışmaz, gizlənməz, O, başımızın üstündədir, beşiyimiz oradır, ordan gəlmişik", demədin, eləmi? Törəlik kişi[93] beləmi olur?

---

[90] Uyuq — bostanlarda quşları, heyvanları qorxutmaq üçün qoyulan bütəbənzər oyuncaq əşya, quşqovan

[91] Sağınc — məqsəd, niyyət

[92] Yabanı — burda ibtidai, vəhşi

[93] Törəlik kişi — Sayılan-seçilən, yol-yolaqlı, adət bilən kişi, dövlət adamı

- Sən də deyə bilməzdin, yavrum! İllərcə qarşını kəsib, bu sözləri söyləmənə yol verməmişəm. Bundan sonra da yol vermərəm! Allah gözlə görülməz, anlayışla bulunar...

- Bax, ustadım! Söylə mənə, görüm nə deyir yerin altını-üstünü bilən kişilər?

- Mənim düşüncəm "elin inancına qarşı durmaq olmaz", deyir. Min illərdi atalarımız onlara tapınıb.

- Atalarımıza qalsa "doxsan doqquz bayım-bayatım var", deyəcək. Bütün törənmişlər yaradana bağlıdır. Yaradılanla öldürüləndən Tanrı olmaz. Yonulma ağaclara inananlar yaradıcını qavrayamazlar. Ulu Tanrı ilki, sonu olmayan, yaradan, ancaq yaradılmayan, bu gün var olanı sabah yox edən, ancaq özü yox olmayan, yaşam verən, yaşadandır. Keçi, sığır uyuğumu bacaracaq bunu? Bu uydurma "tenqriciklər" Ulu Yaradanın adına yaraşmaz.

- Sözünü bil, Oğuz! Yonma ağac dediklərinə inanmaya bilərsən, ancaq xaqan babana və ulusa qarşı gedə bilməzsən. İnanc özlüyündə nədir, mən də anlamam, ancaq elin əlində bütün nəsnələri kəsib doğrayan iti qılıncdır. Sən elig, xaqan olacaqsan. Belə düşüncəylə gələcəyini itirərsən.

- Babamdan sonra söyləsəm, "Xan babasının tutsuqunu[94]-vəsiyyətini pozdu, xaqanlığını qullanıb inancımıza saldırdı" deyərlər. İndi asılılığım yoxdur. Quş kibi! İnanc seçmək əlimdədir. Ulusumuzu tək olan Tanrıya inandırmasam, başqa şey istəməm! Palçıq tenqriciklərə tapınan eldə xaqan olmakdansa, öz özgür düşüncəmin bəyi olaram.

[94] Tutsuq — vəsiyyət

Uslu Xocanın üzünün görünüşü tez-tez dəyişirdi. Gözləri anidən alovlanıb da sönürdü. Qorxu, sevinc, onur bir-birinə qarışmışdı.

- Ağır yol tutduğunu, bu yoldan dönməyəcəyini bilirəm, yavrum! Mən səni yerin-göyün bilgisinə qovuşdurmağa çalışdım. Törələrə toxun, demədim. Atana, babana qarşı çıx, - demədim. Oysa bundan sonrası alın yazısına bağlıdır.

Oğuz xan dedi:

- O gecə mən Ata ünürün varlığını görərək, qorunmasına sevinərək ucaldım. Babam da içində, keçmiş böyüklərimlə öyündüm. Gecə yeyib-içmək şöləndindən yayınıb geri döndüm. Tonqal başında, yıldızların altında qamlarla baş-başa qaldıq. Bögü, bilgin kişilərdi. Mən dedim, onlar dinlədi, onlar dedi, mən dinlədim. Düşüncələrini oxudum. Yağmur daşından deyilənlərin doğru-yalanlığını anlamaq istədim. Bunlar mənim gələcəkdə tör başına keçəcək ortac olduğumu bilir, açıq danışırdılar. Çox şeyi öyrəndim. Dan üzü gözümün acısını almaq istərkən ilginc bir düş gördüm. Uykuda önümə qarşı yaxasına göz yetməyən bir su çıxdı. Tuluqları üfürməyə çağ bulmadan, ağ Azman atım məni vurdu suya, batmadı, üzməsi gərəkmədi. Su sanki qabalaşdı, daşa döndü ayagının altında. Yorğa yerişini pozmadan, yüyürək qarşıya keçirdi məni. Tam bu anda bulutlar aralandı. Göy üzünə baca açıldı. Ordan üstümə bir topa işıq düşdü, işığın içindən dənizlərdən dərin, gülümsər bir göz mənə dikildi. Bu gözdə göyün bir parçası sular kibi dalğalanırdı. Danışan da bu göydü: "Öz əliylə süslədiyi törənmişlərə tapınanlar suç işlətdi. Səni yer üzünə öz istəyim, yüksək ruhum,

yalavacım kibi göndərdim. Ulusa üz tut, onu düz yola səslə. Özünə güvən, düşündüyünü elə, elədiyinə inan. Başının üstündə mən var ikən, mənə inamını itirmədikcə, göyün, yerin düzənini pozmadıqca, səni kimsə üstələyə bilməz!". Burda göz qapandı, mən bayrağımın göy üzünə açıldığını gördüm.

Uslu Xoca düşüncəyə dalmışdı. Handan-hana Oğuza baxıb:

- Yozumu yaxşıdır, ancaq bunun bir uyğu olduğunu unutma, - dedi.

- Xocam, uyğular bitmədi... Buna bənzər uyğular öncə də görmüşəm, sənə söyləmişdim. Uyğulara, cadulara önəm vermədiyini bilirəm, ancaq o səhər başqa bir olay da olunca, mən el arasına çıxıb düşüncəmi açmaq çağının yetişdiyini duydum.

- Başqa nə olmuşdu? - Uslu Xoca sordu.

- Qam Atanı və çıraqlarını cinlətməkdən qorxub uyğuda gördüklərimi onlara açmadım. Ancaq ilginc olan mənimlə bir Qam Atanın da bənzər uyğu görməsiydi. O gizlətmədi: "Tanrı nişan vurduğu qoldan qorxmaq gərək! - dedi. "Sən göylərin savçısısan, seçilmişsən. Bunu dan üzü uyğumda gördüm. İnci suyunun yaxınında iki ağac dikilmişdi. Biri fıstıq, bir şam. Ancaq fıstıq da şam təkin güzdə də solmamışdı, yaşıldı. Ağaclar arasında kiçik təpəcik vardı. Baxanda ona göydən bir işıq vurdu. Təpəcik gözümün önündə ulaldı[95], yarıldı, üstünə bir ağ alaçığ çıxdı. Alaçıqda əlində Yağmur daşı sən oturmuşdun, bütün ulus da önündəydi". Belə dedi Qam Ata. Başqa bir söz söyləsə "ürəyimi alır" düşü-

[95] Ulalmaq — yüksəlmək

nərdim. Ancaq bir dan üzü bənzər uyğuları görməmiz ilgincdir. O xaqanlığımı gördüyünü deyir, ancaq bu uyğular bir xaqanlıqdan yana deyil. Bunu o da bilir. Di gəl, açamaz! Tanrım bunu məndən bəkləyir! Geri dursam, onun yolundan sapmış olaram...

Uslu Xoca sözündə dönməzdi:

- Sən Qamların uyqularını başqalarına ötürdüklərini, uzağdan-uzağa düşüncələri yönəltdiklərini bilmirsənmi? Onları dinlə də, uyma! Mən də bir qamam! Yerlərin, suların dilini bilirəm! Ancaq caduçulara uymaram! Qamlar səni babanla üz-üzə qoysalar, el uçuruma yuvarlanar.

Uslu Xoca Ərkondan nə vaxt ayrılacaqlarını sordu. Oğuzdan eşitdiyi onu çaşdırmış, ancaq bunu sezdirməməyə çalışırdı. Gözü yol çəkdi, fikir bürüdü onu. Sözügedən gün kiçik ayrıntılarla, bənzər uyğunu o da görmüşdü. Ancaq o İncini suyla yox, qanla dolu görmüşdü. Oğuz bu qan çayını ayağı altına baxmadan adlamış, göydən enən bir topa işığın içində yer üzünün sonuna doğru yürüdükcə yürümüşdü. Uslu Xoca yuxusunu yetirməsinə söyləmədi. "Qaynar dərə keçidsiz olmaz", - deyə düşündü. Olsun kim, bir çıxış yolu bulunacaq...

## OĞUZUN EVLƏNMƏSİ

Babasının Banuya elçi düşməsi Oğuzu çaşdırdı. Üç əmisinin üç qızı vardı. Bir yerdə böyümüşdülər. Üçü də Oğuza vurğundu. Bir-birindən gizli üçüdə Oğuzun onu seçəcəyi ümidiylə yaşayırdılar. Oğuza qalsa kiçik əmsinin qızı Aytacı seçərdi. Qızların ən kiçiyi olsa da ən gözəli, ən ağıllısı da oydu. Ancaq seçimi babası eləmişdi.Onu qıra bilməzdi.

Oğuzla Banunun düyünü Sığnaqda oldu. Şənlik yeddi gün- yeddi gecə ara vermədi. Ozanlar Oğuzu öydü. El bahadırlarından soylamalar söyləndi. Uzaqdan-yaxından gələn igidlər at qovub dad aldılar, ox atıb ad aldılar, qurşaq tutub ipək köynək aldılar. Sürü-sürü qoyun qırıldı, tuluq-tuluq içki içildi. Aclar, kimsəsizlər doyuzduruldu. Aydan arı, sudan duru, dağlar çiçəyi, elin göyçəyi Banu ox atdı, Oğuz bəylik çadırını oxun sancıldığı yerdə dikdi. Gəlini bəzəyib-düzəyib, ap-alca[96] geyimində, yanında dadısı-yengəsi, çalğıyla bəyin ağ çadırına gətirdilər. Oğuz gün çırtlayandan atına at ulaşdırmadan, oxuna ox çatdırmadan, dizini yerə gətirtmədən yarışıb-yürüşüb, qurşaq tutub,

[96] Ap-alça — qıp-qırmızı

yelətmə[97] oynayıb, sonda yaxanıb, ipək ərgənlik geyimini geyib murad alaçığına girdi. Banu alaçığın ortasındaca ayaqda, ağzıduvaqlı onu gözləyirdi. Görüncə qarşı gəldi. Oğuzun əlini alıb öpmək istədi. Oğuz əlini öpdürmədi. Əmisi qızının başını qaldırdı, duvağını açdı, alma çiçəyitək ağ üzünə baxıb:

- Tanrı muradımızı versin, qız! - dedi.

Banunu qollarına alıb köksü bərabərinə qaldırdı, yanaqlarını başıdumanlı qoxlayıb, dodaqlarını köz kimi yandıran dodaqlarına dayadı, dirilik suyu içirmişcəsinə içdi. Banu əmisi oğlunun boynuna sarıldı. Sonra qolları boşaldı, heydən düşdü, "boz börünün ruhu, yardımçım ol!", - dedi.

Oğuz Banunu süslü yatağa uzatdı. Yaxasının düymələrini açıb tək-tək üst köynəyini, alt köynəyini, topuqlarına qədər enmiş dizliyini çıxartdı. Dan üzünədək murad alıb, murad verdilər. Dan ertə Banu başını bəyinin köksünə qoyub quzu kimi büzüşmüşdü. Oğuz arxası üstə uzanıb alaçığın dünlüyündən[98] göyə baxırdı. On beş günlük ay onlara tamaşa edirmişcəsinə alaçığın dünlüyünün ortasında donub qalmışdı. Göylər alaçığı dolduran ay işığı ilə birgə bir əlçim ağ buludunu da göndərmişdi; o indi Oğuzun köksünə baş qoyub, arzusuna çatmasından doğan sevinc və xoşbəxtlik içində uçunur, sakitləşdikcə dili açılırdı: "Qanım, xaqanım, yigidim, tengrilərimə min alqış, səni mənə yazmış!" Üç gün, üç gecə alaçıqdan çıxmadılar. Sonra qaranlıq düşəndə Oğuz başının adamlarıyla, yoldaşlarıyla birgə dərədə çağla-

---

[97] Yelətmə — coşqun toy rəqsi

[98] Dünlük — alaçığın göyə açılan üst bacası

yan suya endi, Banunun itirmək istəmədiyi ətrini-qoxusunu bumbuz suda yudu.

Bir gün Oğuz Banuya: "Tenqrilərim demə, Tanrım de! Doxsan doqquz bayatımız yoxdur bizim, tək bir Göy Tanrımız var, mən də onun elçisi, yalavacıyam! Buna inan, qəbul et, başqalarına da söylə!", - dedi.

- Başım ayağının altında, ancaq inancıma toxunma, Oğuz! Sözünü bil! Ulusumuzu qurtarmış boz börüyə Tanrı deməyib, nə deyəcəksən? Göy Tanrı dediyin hardan çıxdı? "Ərim Tanrının elçisidir", söyləsəm, "Banunun qafası pozuldu", - deyübən məni daşlarlar. Sus, bir də ağzına alma bu sözü!

- Dediyimi deyib məni tutmazsansa, yatağımızı ayıracağsan, - dedi Oğuz. - Yavuqum, xanımım mənə inanmasa, el necə inanar?

O gündən Oğuz Banuya yaxınlaşmadı, bir neçə gün gözləyib, sonra alaçığını da ayırdı. Banu gündən-günə əridi. Ərinin onunla baş yastığa qoymadığını anasına anlatdı, nədənini açmadı.

Qara xan eşidəndə:

- Oğuz düşünmədən iş tutmaz! Banunu bəyənmədisə, Küz kardaşımın ondan da irəli qızı var, onu alarıq, - dedi, elə həmin gündəcə ikinci qardaşından qızını istədi.

Qardaşı dedi:

- Böyüyümüz sənsən! Sözünə bağlıyıq. Tərçiçək qurban olsun Oğuza.

Yenə düyün oldu. Yenə Tərçiçəyin atdığı oxun sancıldığı yerdə dikilən ağ alaçığda Oğuz Tərçiçəklə murad verib, murad aldı. Yenə gəlini Tək Tanrıya tapınmağa, onu Tanrı elçisi deyibən tanımağa çağırdı. Tərçi-

çək də onun qafasının oynadığını düşündü. O da Banunun yoluyla getdi. Oğuz ağ alaçıqında yenə yalqız qaldı. Doğmalarının qızlarının onu tutmamaları Oğuzu qırdı. "Bir də evlənməm, yetər!", - deyib yurddan uzaqlaşdı. "Alın yazım beləymiş. Tanrı məni paylaşmaq istəmədi, onun yolundan başqa yolum yox nə istəsə onu yaparam" - deyərək, alrlarla çöllərdən yığışmadı. Atası ardınca adam saldı, əmisi qızlarını bəyənmədisə, başqasını alarıq dedi, onun yurddan uzaqlaşmasına üzüldü.

Oğuz:

Babam inciməsin, yurddan qopmamışam, ərdəşlərimlə ov ovlayıb, at qoşub dincəlirik, bir daha evlənməyi isə ağlıma gətirmirəm, xaqan babamın gərəyi olacağım andaca geri dönəcəyəm, - dedi.

Bir gün yeyib-içəməkdən, at qovmaqdan yorulub, ormanda fısdıq ağacının altındaca uyumuşdu. Yarıyuxulu quşların səsini eşidirdi. Hansı quşdu, görəsən? Yorulmaq bilmədən, tək bir sözü çevirirdi:

- Dur get! Dur get!

Birdən fısdıq ağacının budaqları aralandı, başının üstündə Ərkonda gördüyü gözü, Göy Tanrının gözünü gördü. Bu gözün qəzəbli olacağından qorxurdu. Ancaq hər şey ilk gördüyü kimiydi. Sonsuz, qaçılmaz, çəkib-aparan... Tanrının gözü sanki: "Darıxma, hər işin zamanı, çarəsi var, oyan, yurda qayıt!" deyirdi. Oğuz gözünü açantək fıstıq ağacının yaz küləklərində asta-asta yellənən budaqlarına, tər yarpaq donuna baxdı, yerindən qalxdı, yoldaşlarını səsləyib yurda üz tutdu. Yolun kəsəsini seçdi. Yuxuda gördüklərinin sonucunu bilməyə tələsirdi. Kəndə az qalmış çay üstündə qızlar paltar suya çəkirdilər. Çay yaxasına bir sürü

kəpənək qonmuşdu sanki. Çöllərin bütün çiçəkləri bitmişdi burda. Bunlar Qara xanın üçüncü qardaşı Orxanın qızı Aytacın qulluqçularıydı. Oğuz bu gözəlliyə baxmadan ötə bilmədi, Aytacın gülə-gülə ona əl elədiyini görəndə əski xatirələr ürəyimi sızıldatdı, atın başını çəkdi. Aytac ona yanaşdı:

- Xaqan babamın istəkli oğlu kimi gəzir? Burası ov yeri deyil...

- Əmisinin gözəl qızını gəzir...

Aytac öncə güldü, sonra üzü qayğılandı:

- Böyük əmilərimin qızları görk oldu mənə. Onları, tək onları yox əmilərimi də qırdın. Babamın da qırılmasını istəməm!

Oğuz yuxalmışdı, içindəkini deməyə birisini axtarırdı. Aytacın onun dediklərini yerinə çatdıracağını bilirdi.

- Söz açılmışkən, dinlə! Suç onlardadır! Mənim inancıma tapınıb, sözümü tutmadılar. Yolumu bilməyən məni də bilməz.

Aytac inanmırmışcasına:

- Bundanmı ayrıldınız?

- Başqa nə vardı aramızda? "Bir də evlənməm", dedim... Kim məni dediyimcə anlarsa, olduğumca istərsə onunla bağlaşaram. Üçüncü dəfə okum daşa dəysin, istəmirəm!

- Daşa dəyməz! Sən bütün qızların sevimlisiydin . Hansımızı seçəcəyini düşünüb, dartışıb, dalaşırdıq. Onlar böyükdü, yolları da böyükdü. Sıra mənə gəlsə, düşünərəm...

Oğuz Aytacın açıq danışmasından şaşırmışdı, söz yox, elat qızları əzilib-büzülmədən, çəkinmədən

danışandılar, ancaq əmisinin hələ cocuq sandığı qızının belə ürəkli olduğunu bilmirdi; ilk dəfə görürmüşcəsinə baxır, qızlar bulağından su içib ərsəyə gəlmiş qızı sevdiyini vaxtında babasına bildirmədiyinə yanırdı. Birdən fıstıq ağacı altındakı uyğunu, bu yolla hara, nədən tələsdirdiyini anladı:

- Sıra səndədir, Aytac! Başdan yanlış olub! Onların yapdığını sən yapmazsan!..

- Hansı yolunu tutmadılar, anlat, bilim!

- Onlara "bən bir olan Göy Tanrının elçisiyəm", söylədim, "qafan pozulub", dedilər.

Aytac canlandı:

- Sənin göylərin sevgisindən yarandığına, elimizin-günümüzün işığı olduğuna kim sızıkla yanaşa bilər? Kimsəyə bənzəmədiyini, seçilmişliyini, yalavac bilgisiylə dolu olduğunu niyə görmədilər onlar?

- Sən gördünsə, mənə yetər, - dedi Oğuz.

Qız gözünü yana çevirib yavaşca söylədi:

- Mən sənin bir parçanam. Nə istəsən, ona baş əyərəm! Harda sənin sırğan olsa, ora mənə qulaq, harda darağın varsa, ora mənə başdır. Daş qoyduğun yerə baş qoyaram!..

Oğuz heç nə demədən, qızı biləyindən yapışaraq göz qırpımında qucağına aldı. "Düyün gərəkməz bizə" deyib, atını səyirtmək istəyirdi. Aytac nə edəcəyini bilmədən, atdan yıxılmamaq üçün ona sıxılıb qalmışdı. Oğuza "səni tuturam" söyləyəndən sonra geri dura bilərdimi? Qızlar su üstündən çaşqın-çaşqın onlara baxırdılar. Oğuz gəzdiyini tapmışdı. Aytac bütün yönlərdən onun istəyinə uyğundu. Varis olduğundan babası kənar ailələrdən evlənməsini istəməzdi.

Onu yurda döndərmək üçün "kimi bəyənərsə, alsın" söyləmişsə də, içində buna üzülərdi. Oğuz bir anlığa beynində hər şeyi götür-qoy elədi. Aytacın onu anlamasının, onu tutmasının sevinciylə, yenidən yurda dönüb babasının üzüntüsünə son qoyacağının rahatlığıyla doluykən elə indicə beləcə atını ordaya sürə bilərdi... Ancaq gizli bir səs "sən Tanrının savçəsısan,yalnız özünü düşünmə!" deyirdi ona.Aytacı bu şəkildə, oğurlayırmışcasına alıb aparması yaraşmazdı ona. Gələcəyin xatunu əmisi qızlarının yanında nədən gözükölgəli olmalıydı? Bu tələskənliyiylə Aytacın atası, sevimli əmisi Or xanı sındırmazdımı? Bütün bunları düşünərək atdan aşırıldı, Aytacı da alıb yerə qoydu. Qəribədir ki, Aytac da öncə onu alıb aparmaq istəyən Oğuzun sonra fikrini dəyişməsinin səbəbini duydu və Oğuz onun gözündə daha da böyüdü. Oğuz gözünü onun dupduru gözlərinə dikərək:

- Qoy hər şey el adətincə, gələcək xatuna yaraşan şəkildə olsun, - dedi.

Aytac əllərini pörtmüş yanaqlarına tutaraq:

- Qoy hər şey sənin istəyincə olsun, - söylədi.

Oğuz atına sıçrayıb ordaya doğru çapdı.

Onun qərarı Qara xanın ürəyini sakitləşdirdi.

Bir necə gün sonra Aytacı bəzəyib-düzəyib gəlinlik çadırına gətirdilər.

Aytac elə ilk gecə "Bir olan Tanrıya da qurban olum, onun elçisinə də", deyib, ömrünün sonunadək Göy Tanrıya tapınacağına and içdi... Göytanrıçıların ilk ocaqı közərdi...

## ATA, OĞUL

Oğuz babasıyla üz-üzə oturmuşdu. Fil sümüyündən düzəldilmiş geniş el törü, taxt iki nəfərlikdi. Böyük məclislərdə, kənar ölkələrin elçilərinin qəbullarında, el törənlərində Aybikə xatun da, Qara xanla yanaşı əyləşirdi. Xaqan bu gün çox düşüncəliydi. Nədən başlayacağını kəsdirə bilmirdi:

- Qulağıma qara-qura sözlər dəyir, oğul! İnancında möhkəm, ardıcıl olmamağın məni sarsıtdı. Bu boyda ölkəyə xaqan qılınacaq kişi inancın yardımı olmadan heç nə yapa bilməz! Ürəyini didən nədir, anlat mənə! İki qardaşımı, iki qolumu küsdürdün! Qızlarına üz çevirməz oldun. "Göygümüz[99] ola-ola qızlarımızı yalqız qoydu, səndədir, başını boş buraxmısan. Az keçməz, üçüncü qardaşımızın qızını da boşayar!"- deyirlər.

- Düşündüyümü gizlətməməyi mənə sən öyrətdin, xaqan baba! Yer üzündə yaşayan İnsan övladları bir yanlışlıq içindədir. Yeklər[100] bizi aldadır. Dünyanın bəyi ola-ola içimizi köləlik sarmışdır... Qonşularımıza bax! Çində, Hinddə, qırmızı üzlü Tanqut da inanc insa-

[99] Göygü — kürəkən
[100] Yek — şeytan

nın böyüklüyünü önə çəkir, ulusu gücləndirir, birləşdirir. Bizdə isə hər boyun öz iyəsi, palçıq, ağac, dəri uyuqu var... Diz bükə bilmirəm onların qarşısında!..

- Ulusun gözü bizdədir, Oğuz! Elimiz-günümüz laxlayar, bizdən üz döndərərlər. Sənin xaqanlığını qəbul etməzlər!

- Mən kölə ruhlu adamların yox, tək olan Tanrının iradəsinə bağlıyam! Çünki o məni özünə savçı seçib! Bunu bütün el bilməlidir, biləcək də!

- Başsız oğul! Bayatların qəzəbindən qorx. "Elçiyəm" deyən caduçuları, qamları çox görmüşəm! Sonda yoxa çıxmışlar. Yolunu azma! Qolunun gücü, anlayışının kəsəri varsa, tenqrilərimizə ver! Bu, bir üstünlükdür. Yaxşıya yanaşanda yaxşı böyüyür, pisə yanaşanda pis!

- Mənim yaxşılıqdan başqa yolum yoxdur, baba! Qorxu mənə yaraşmaz. Elimizi bu sonsuz aldanışdan, bu qurama bayatlardan qurtarmaq mənə düşür. Bu, bir alın yazısıdır! Gözümü açandan özümü bu yükün altında sanmışam. Bu yoldan məni saxlamaq olmaz! İndiyədək sənə açmadım, sözümü ürəyimdə gizlətdim. Səni qırmaq istəmədim! Tanrının istəyiylə hər şeyi özün duyub anlar, ulusumuzu bu aldanışdan qurtararsan, sandım. Daha susmağa yer qalmadı! Bu işin qutsallığını, Göy Tanrıya bağlı olduğunu anlar, məndən qırılmazsan.

Babası susdu. Coşmaqla Oğuzun yola gəlməyəcəyini anlayır, soylarının[101], bütün qohum-əqrabasının, xaqanlığın taleyinin bu inanc məsələsindən asılı olduğunu ona anlatmağa çalışırdı:

---

[101] Soy — nəsil, burda xalq

- Məni xaqan qılan göylərin istəyiylə, qutsal törələrimizdir. Son günümədək elimizi-günümüzü[102] qorumalıyam! Törələrimizə, düzənimizə[103] doğma oğlum da qarşı gəlsə yeniləcək; elin könlünə, inancına əl atsa, əli kəsiləcək, öldürüləcək, yeyici yerə gedəcək. Bunu anla və unutma!

- Alın yazımız nəsə, onu da görəcəyik, baba! Mən anadan Bir Tanrılı doğuldum. Ondan başqa inancım yoxdur. Ulu Tanrı yardımçımız olsun!

Qara xan yerindən sıçradı. Aybikə xatun onun əlindən tutub aşağı dartdı:

- Qara xan! Sən eligsən, törəmizi , inancımızı da qoruyan sənsən! Mənsiz yarlıq[104] çıxara, qərar verə bilməzsən. Coşma, bax da dinlə! Oğuzun bilmədiyi bir gizlini açım sənə! İyirmi il içimdə saxladım. O doğulanda necə üzüldüyümü görmüşdün. Nədəndir bu, sordun, bilmirəm, dedim. Doğruydu! Körpə məni əmmirdi. Üzünü məndən çevirirdi. Döşlərim şişib köynəyimə sığmırdı. Yeriyəndə yaxam islanırdı. Ağlamaqdan, bayatlara yalvarmaqdan yorulmuşdum. Çadırımızdakı Tenqrınklere diz çökməkdən dizim yara olmuşdu. Oğlumun yaşayacağına ümidim qalmamışdı. Bir gecə yavrum uyğuma girib: "Südünü əmməyimi istəyirsənsə, bütlərdən uzaqlaş, tək olan Göy Tanrıya tapın, onu tanı!", - dedi. Üç gecə ard-arda uyğuda bu sözləri söylədi mənə. Səndən gizli oğlumun Bir Tanrısına tapındım, ona yükünc qıldım. Desəm inanmazdın, məni də, çocuğumu da öldürərdin. Əlimi göyə

---

[102] El-gün — dövlət
[103] Düzən — hakimiyyət sistemi, qayda-qanun
[104] Yarlıq — burada hökm

qaldırıb: "Ulu Tanrım, Göy Tanrım, südümü çocuğumun istəyinə uyuşdurub, dadlı et!" - deyərək yalvardım. Söz ağzımdan çıxdığında Oğuz mənə sığınıb əmməyə başladı. Onun Göy Tanrının seçilmişi, istəklisi olduğuna inandım. Bir yaşında gözlənilmədən dil açdığını unutdunmu? "Bən Göy Tanrının yerə göndərdiyi işığam. Onun üçün adımı Oğuz qoyun!" dediyi qafandan silindlimi? Dil açdığının sevinci içində nə dediyinə varmadan: "Bizim urug-turuğumuzda bundan daha görklü cocuq doğulmamışdır", - dedin. Yürüşdən, savaşdan, xaqanlıq qayğılarından necə böyüdüyünü duymadın. Oğuzun gecə-gündüz Tək Tanrı deyib, Göy Tanrını anıb, yaşıdlarına da beləcə anlatdığı, uyğularında da tez-tez söylədiyi "bir olan ulu yaradana alqışlar olsun", sözləri səni düşündürmədi. Oğlunun üzündə Ulu Tanrının işığını görmürsənmi? Bu boyda ərənlik, ərk, güc, sonsuz bilgi hardandır bəs? Düşünmədinmi? Ox atmaqda, göndəri[105] tullamaqda, qılınc çalmaqda, bilgidə qarşısına kim çıxa bildi? Bütün bunların Göy Tanrıya bağlı olduğunu, oğlunun başqa çocuqlara bənzəmədiyini düşünəydin gərək! Oğuz səndən sonra yurdun da, yer üzünün də dayağı olacaq. Bunu qamlardan da, Çin caduçularından da eşitdim. İllər öncə çinlilərin "Türkdə bir çocuk doğdu, yer üzünün düzənini dəyişəcək" deyibən gəzdiklərini, hər yana baş vurduqlarını unutdunmu? Təkcə xaqan sarayına burun soxa bilmirdilər. Aradıqları çocuğun sənin evində doğula biləcəyi ağıllarına gəlmirdi. O çağdan çox sular axıb. Oğuzun yaşından bö-

---

[105] Göndəri — nizə, süngü

yük düşündüyünü, addım atdığı yerə işıq daşıyan birisi olduğunu çoxları görüb, səndən başqa. Olsun! Səni qınamıram. Günün savaşlarda keçdi. İndisə ayıl! Biz bir olan Tanrıya tapınmışıq, sən də tapın!

Qara xan başını tutub taxta çökdü:

- Altımda törüm çöküb, duymamışam! Döşəyimdən xatunum qaçıb, bilgim yox! Doğma oğlum inancımızdan dönüb, şaşırıb kəndisini yalavac sayır, qandıranım yox! Ulu ruhlar, hanki suçuma görə?

Aybikə xatun xaqanın bu qısa sakitliyindən, götür-qoyundan ürəkləndi. Qolunu xaqanın boynuna saldı:

- Yazıya pozu yoxdur, xaqanım! Oğlunla xatununun inancını illər boyu duymamısan, bundan sonra da duyma! Bizə qıysan, bütün ulusun çökər. Öz evinin başqa inanca bağlılığından onillərlə bilgisiz qalmana kimsə inanmaz. El dışlar səni! Düşmən baş qaldırar. Burax hər şeyi yaradana! Qoy çözüm ondan gəlsin. Kim bilir, bəlkə də Oğuzu qaytaracaq ulusun yoluna...

Aybikə xatun illərcə, uzun-uzun düşünüb indi söylədiklərindən başqa yol bulmamışdı. Xaqan bunu anladı. Üzdə içindəki yanğını boğdu, ancaq ürəkdə xatunu, Oğuzu bağışlamadı: “Öz oğlumun ölütçüsü[106] olmaq da mənim alın yazımmış” deyə düşündü.

Törəyə görə el başqanlığıyla inanc başqanlığının bir olması[107] yurdu ərkli, güvəncli saxlayırdı. Ancaq indi Qara xanın ayağının altından yer qaçmışdı: “Baba şərəfi oğula qalır” deyirlər. Hansı oğula? İnancından dönənəmi? Boyunu oxşadığım, yerimdə görmək dilədiyim, sevgili oğlum! Eli sənə tapşırmaq istərkən

[106] Ölütçü - qatil

[107] Qədim türklərdə xaqan həm də xalqın dini rəhbəri sayılırdı

əlimi, dilimi qısaltdığın nəymiş? Bir mənim oğlum üçün elin qırılmasını necə istəyə bilərsən? Yağıları güldürəkmi üstümüzə? Törə bilməz xaqan başqalarını necə uydurar[108]? Bir yanda budun, el, törə, xaqanlıq, bir yanda Oğuz... Babasına dirəşən, onu dinləməyən, bir sözüylə elin düzənini pozub yerlərimizi yağulara qapdıra bilən Oğuz! Yox, bu söz elə açıla bilməz! Xaqanlıq əldən gedər! Olsun!"

Qara xan bundan qorxmurdu. Keçib gəldiyi yolları, eli üçün elədiklərini düşünərkən, ölüm qorxusunu unudurdu. Özünü bilәndən yurdu üçün çalışmış, ağır savaşlardan, ölümlərdən keçmişdi. Bu gün də olmasa, sabah xaqanlıqdan ayrılacaq onsuz da! Onu düşündürən elin sonrakı günüydü. El yenidən sına, bir bayraq altına toparlanmış torpaqlar yenidən yağıların əlinə keçə bilərdi. Eli qorumaq üçün, gərəkirsə, özünü də Canalana verər, doğma oğlundan da keçərdi. Başqalarından düzən istəyən xaqanın öz sarayında inanc satqınlarının varlığı bilinərsə atalarının, böyüklərinin bütün əməkləri puça çıxardı. Bundansa onun ya Oğuzun getməsi daha düz yoldur. Elmi, oğulmu? İndi üçüncü yolu tapa bilmirdi... "Deməli, iş böyümədən Oğuz Ulu dediyi Tanrısının yanına getməlidir. Yeri uçmaq olsun! El oğuldan irəlidir." Ancaq bunu necə yapacaq? İllərlə boyunu oxşadığı oğluna əli necə qalxacaq? Ondan sonra nə sayaq yaşayacaq? Onda necə olsun? Minlərlə yurddaşın, soydaşın qan töküb, baş qoyub qoruduğu, böyütdüyü el bir cayğın oğulun oyunuyla dağılsınmı? "Ulu bayatlar, yardım edin, çözün bu çözülməz işi! Qoy oğul ölütçüsü olmayım!"

---

[108] Uydurmaq — uyğunlaşdırmaq, qanuna uyğun idarə etmək

İndi Qara xanın bu işi tez aşırmaq üçün yükünc qılaraq, yalvarmağdan başqa, yolu qalmamışdı.

* * *

Güz xanla Kür xan qızlarına Oğuzun üz vermədiyini, kiçik qardaşları Orxanın qızını alaraq, düyünlə apardığlarını ayrı alaçıqda saxladığını, sormadan, könüllərini almadan onlarla soyuq davrandığını ağrıacıyla izləyirdilər. Xaqan olacaq Oğuzdan keçməsələr də, üzünə vurmasalar da, içdə ondan qırılmışdılar. Qızlarının öcünü almağ dəmi gələcəkdi. Ancaq Qara xanın qorxusundan səslərini çıxarmırdılar. Oğuzun Aytacı alması onların gözündə kiçik qardaşları Orxanı da yada çevirmişdi. Suçu onda, qızında görürdülər.

El yaylağa yığışanda Oğuz babasına dağların ovu tükənməmiş, yaylalar yurdlanmamış yoldaşlarıyla Issık gölə ova getmək istəyini bildirdi. Ötən yazın yolçuluğunda könlü o dağlarda qalmışdı. Babasıyla sözləşdiyindən evə sığa bilmirdi, dalğındı, yurddan uzaqlaşmaq istəyirdi.

Qara xan "getsin də gəlməsin" düşünüb, "olar" söylədi. Oğuz ov dedi, ova getmədi. Başında ağır döyüşlərə apardığı ərlər bir il öncə asta-asta keçdikləri yolu bir neçə gündə adlayıb Xantenqrinin qoynundakı Ərkona, Ata mağaraya ulaşdı. Ərkon sızrasında ov ovladı, quş quşladı, yerli bəkil bəylərlə, qamlarla gözəl günlər keçirdi, hər kəsi bir olan Göy Tanrıya tapınmağa çağırdı. Qam Atanı da inandırmağa çalışdı. Yola burdan çıxmalıydı, hər şey burdan başlanmalıydı... Sonra sözlə anlamadıqlarını görüb: "bu uyuğlar-

dan, yonma ağaclardan Yaradan olmaz, bunlar ulusu yüksəlişdən saxladı" deyə özünü çılğınlığa vurub Ata mağaradakı doxsandoqquz bütü yıxıb dağıtdı. "Baxın, Göy Tanrının üzü gülür, sizin bütlər isə özlərini belə qoruya bilmədilər" deyib yoldaşlarını da çəkib getdi. Hələ el köçməmiş, yaylalarda əylənə-əylənə qarşı gələn yerli bəyləri Göy Tanrıya tapınmağa çağırdı. Kəsərli, inandırıcı sözü qarşısında söz tapa bilməyənlərin taxta çələbilərə olan-qalan inamlarını alt-üst elədi: "Ata ünür bundan belə oyuncaq uyuqların, bütlərin saxlancı deyil, Ulu, görklü Göy Tanrının ocağı, elin bilgisinin, bitiklərinin xəzinəsidir" dedi.

O yay, Qam Atanın dünyası dağılmışdı. Qara xanla gələcək xaqan arasında qalmışdı. Tapındığı bütlərinə ağlayırdı. Bir yandan da: "Ata mağaranın qutsallığı ayaq altına atılanda kim onu arayacaq, onun eldəki sayğısı, dəyəri nə olacaq?", - düşünürdü... Çapar saldı, olanları Qara xana çatdırdı.

* * *

Hər kəs yükünü qablaşdırmış, ev-eşiyini yığışdırmış, qalanlara sonuncu tapşırıqlar verilmiş, alaçıq çığları dəstə vurulub bağlanmış, keçələr bükülüb çinlənmiş, axtarmasınlar deyə yüklət[109] atlar, qatırlar, yeltənmək[110] çağının çatdığını duyaraq yiyələrinə göz qoya-qoya, tələsmədən göyşəyən dölək[111] dəvələr, buğralar hörüyə vurulmuş, ya da qapılardakı ağaclara, mıxlara bağlanmışdı.

---

109 Yüklət — yük daşıyan
110 Yeltənmək — uzaq səfər
111 Dölək — cins

Qara xanın sayı bilinməyən savaş ləvazimatı, yaraq-yasaq, xəzinə, pay-ürüş arabaları xaqanlıq çadırlarının yan-yörəsini bürümüşdü. Dan üzü ağır el yerindən tərpənəcəkdi. Köç öncəsi böyük xaqan Sığnaqda sönuncu şölənini düzənləmişdi. Qardaşlardan, qardaş uşaqlarından, yegənlərdən, göyənlərdən başqa kimsə çağrılmamışdı. Yürüşlə bağlı gənəşmə yığnaqlarında içkin adamlardan başqası olmazdı. Bunun üçün bu yığnaqlar daha uzun, gözlənilməz dartışmalarla keçərdi.

Bu axşam Güz xanın qızı Banunun evində başqa bir toplantı da vardı. Güz xan xaqanın çağrışına getməzdən öncə qardaşı Kür xanı da yanına alıb qızına baş çəkmişdi. Onun könlünü qırıq görüncə sorğulamış, qızdan söz ala bilməyəndə qonşu evdən qardaşı qızı Tərçiçəyi də çağırtdırmışdı. Oğuzun iki "yarımamış" qadını atalarıyla baş-başaydılar. Nə qədər gizləsələr də işin bundan belə örtülü qala biləcəyinə inanmırdılar. Yabğu xaqanın torunları olaraq yollarda, aranda, dağda olsa belə, ulusun törələrinə sayğılı böyümüşdülər. İnanc pozulsa, atalarının, babalarının elin başında dura bilməyəcəklərini anlayırdılar. Boz börüyə, bütlərə, ulu ruhlara ürəkdən tapınmaqdan şərəf duyurdular. Quş təkin azad, udlu[112], - həyalı böyümüşdülər. Gözlənilməz hadisələrlə üz-üzə gəlib bunaldıqları[113] çağlarda da özlərini itirməz, könül sözlərini söyləməzdilər. El "hu" deyib, bir ağızla doxsan doqquz tenqriyə üz tutanda, gözlərində yaş giləlnən qızlar Oğuza, onları atdığından daha çox, ulusun inanclarına dönük çıxdığına görə qızğındılar.

---

[112] Udlu — abırlı

[113] Bunalmaq — qəmlənmək, möhnət çəkmək

Bir yandan da çocuqluqdan hamısının gözünün işığı olmuş, ərənliyi, ağlı, düzlüyü eldən-elə yayılmış Oğuzu içdən sevirdilər. Banu daha çox üzülürdü. Oğuzla göbəkkəsmə olduğunu hər kəs bilirdi. İllər uzunu böyüyüb Oğuzun adaxlısı, sonra qadını olmaq arzusu ürəyini sarmışdı. Ona könül verəndə, ox atıb ağ bəylik çadırı quranda, al düyünlük geyimində o çadırın qapısından girəndə, özünü dünyanın ən xoşbəxt adamı sanmışdı.

Qızlar dirəşsələr də, sonda olanları babalarına anlatmaqdan başqa yolun qalmadığını gördülər. Gözlərindən yaz yağmuru kimi sellər axdı. Anlatdılar. Qardaşlar: "Bu bir sevgi işi deyil, qara buluddu, ulusun üstünü almış ölümdü, qardaşımıza açılmalıdır" dedilər...

* * *

Oğuzla babasının soyuqluğu, Ata mağaradakı olaylar elə çatmazdan öncə Çinə çatmışdı. Daha doğrusu, Çindən də öncə Tabqaça çatmışdı. Tabqaç Türklə Çin arasında bir eldi. Özlərini türkə yaxın saysalar da, köklərini unudub çinlidən daha qatı çinsevər olmuşdular. Türk kökənli olmaqla deyil ki! Ona qalsa, Çində dövlət quranlar, ona min beş yüz il başçılıq edən, çeşidli, dəbdəbəli Çin adları altında pərdələnən göy oğulları, sülalələri də türksoyludurlar, Çinin gur, tox yaşamı onların asan olmayan çöl həyatı anılarını söndürmüş, çağlar içində izlərini - özlərini itirib çinli olmuşdular. Düzünə qalsa, bu aşınmaya qarşı dirənişlər də yoxdu. Çünki hakimiyyət, yaxşı gün yanında soy kimliyini xırda iş sayırdılar. İlk öncə - Çini özümüzkü edəcəyik düşüncəsiylə gəlsələr də tezliklə özləri çinli olurdular.

Bununla belə, qan yaddaşı onların bu yad eldə izsiz-soraqsız itmələrini önləyirdi. Çöllə Çini yaxınlaşdırmaq istəyi burdan gəlirdi. Bunu çinyanlısı kimi edənlərlə yanaşı, bu bağlılıqla Çində öz soylarından olanları gücləndirib artırmaq istəyənləri də vardı, bu yolla Çini dəyişib türkləşdirəcəklərinə inanırdılar.

Çinin quzey-batısından gələn Tabqaç elçiləri Oğuzu yolda buldular. Elçibaşı açıq danışdı:

- Ulu Çin imperatoru sizə bayraq, xaqanlıq verir. Döyüş ərləri, savaş ləvazimatı... nə istəsəniz! Bayrağınızı harda ucaltsanız, biz yanınızda olacaq, sizi qoruyacağıq... - dedi.

Oğuz coşdu:

- Sizin qafanız pozulmuş! Bizim bir elimiz var, bayrağı, ordusu, əri, ərəni, ərki, görküylə! Onun başında babam dayanır. Mən xaqan deyiləm! Onun əsgərlərindən biriyəm!..

Oğuz bunu Çin elçisinə dedi. Öz-özünə isə "İt kimi iy bilir, babamla üz-üzə qoymaq istəyirlər məni. Babam sağ-salamat, ayaqdaykən ölüm aşına[114] tələsirlər, alçaqlar!" deyə düşündü. Elə o andaca babasıyla sözləşməsinə üzüldü. Axınlarda qoşa at səyirtdiklərini xatırladı, dönüb yurda qayıtmağa tələsdi. Hansı yolla olur-olsun babasının könlünü alacaqdı!..

* * *

Xaqanlıq sarayında ailə yavuqlarının, Yabqu xanın belindən gələnlərin, sübaşı, tarxan[115], gənəşçilərin

---

[114] Ölüm aşına tələsmək — yasa tələsmək

[115] Sübaşı, tarxan — ordu başçıları

də qatıldığı şənlik davam edirdi. Qardaşları ilə gəlinlərinin, gec də olsa, yeməyə qatılmaları Qara xanın könlünü açmışdı. Aybikə xatunun solunda üç gəlini, üzlərini yüngül ipək duvaqla örtərək oturmuşdular. Şölən yarıdan ötmüş, yeməklər yeyilmiş, içətlər içilmişdi. Ancaq Qara xanın içki qabı ara vermədən dolub-boşalırdı. Yetişmiş çiyələk rəngində küpə suyuyla içini yumaq istəyirdi sanki. Gəlinlərinə üz tutub dedi:

- Qadınlarımız duvağa öyrəncəli deyillər. Gəlinim kimi yox, qardaşlarımın istəkli qızları kimi sıxıntısız oturun!..

Gəlinlərin titrək əlləri duvaqlarına uzandı. Qara xan sordu:

- Nədən öncə gətirdiyim gəlinlərim Banu ilə Tərçiçəyin gözəllikdə Aytacdan geri qalmadıqları, bəlkə üstün olduqları Oğuzu ilgiləndirmədi? Törəmizdə bir evlilik var, ancaq ona keçdik, iki kərə evləndi. Oysa nədən üçüncü evliliyə könül verdi, kiçik qardaşımızın qızına bağlandı, gününü onunla keçirtdi?

Gəlinlərin başları yerə dikilmişdi.

Ox yayından çıxmış, söz açılmışdı, Qara xan Oğuzu sonadək anlamağa, qardaşlarını incidən məsələni aydınlaşdırmağa çalışırdı. Üzünü onlara tutdu:

- Qolumun gücü, belimin qılıncı, dayağım qardaşlar! Siz də bilmirsinizmi bunu?

Güz xan sözu onlardan öncə xaqanın açmasına sevindi. Ancaq öz deyəcəklərini sonraya saxlayırdı. Söylədi:

- Böyük xaqan, qoy gəlinlər desin! Onlar biləni biz bilmərik.

Xaqan üzünü Banuya tutdu:

- Sən anlat, böyük gəlinim!

Banu gözünü yerdən qaldırmadan söylədi:

- Sormasanız, deməzdim. Bu, bir bəyənib-bəyənməmək işi deyil. Dilim-ağzım qurusun... Başımızda qara buludlar dolanır, xaqanım!

Yalnız indi, bu şöləndə Oğuzun Aytacla evlənməsinin bir istək işi olmadığı, inancla bağlılığı, ondan öncəki xanımlarını da inanca görə atması ortaya çıxandan, arada gəzən quvlamaların[116], pıçıltıyla deyilənlərin saraya, tör ayağına gətirildiyini görəndən sonra Banu alqayıban[117] ürəyində Oğuza olan bütün sevginin nifrətə çevrildiyini duydu, bu hadisənin ev içindən, saraydan çıxıb, yurdu, ulusu bürüdüyünü anlatmaqla, xaqan babasının yanında Oğuzun suçunu şişirtməyə çalışdı:

- Ayağında ölüm, xan baba. İnancsız el olmaz, elsiz xaqanlıq. Oğuzun yolu törəyə, elə, Sizə qarşıdır. Onu özümdən çox sevsəm də, Sizi, yurdu ondan da çox sevirəm. Oğuz inancımızı atıb, bizə: "Göy Tanrını tutun. Mənim bir olan Tanrımı tanımasanız, mən də sizi tanımaram" dedi. Mən "Göydə Tanrı olmaz, Göyün harasında oturur Tanrı?" dedim. Onun Qutsal bütlərdən uzaqlaşmasına, səni saymamasına qızdıq. O da bizi atdı. Aytac onun buyruğuna böyun əydi, Tək Tanrıçı oldu. Oğuz da ona bağlandı. Oğlunuzla sevimli qadını indi ayrı bir inanca tapınırlar. Atalarımızın yolundan çıxmışlar artıq...

Qara Xan kiçik gəlinindən sordu:

- Doğrumu deyilənlər?

---

116 Quvlama — dedi-qodu

117 Alqayıban — qəfildən

Aytac qorxusundan ödünü udmuşdu:

- Doğru deyil, böyük xaqan! Oğuz məni özümə görə bəyəndi. Böyük gəlinlər sevilmədiklərini şişirdib inancla bağlamasınlar.

Qara xan bağırdı:

- İndi hansınıza inanmalıyıq sizin?

Qışqırırdı. Böyük gəlinlərinin doğru dediklərini bilə-bilə. Aybikənin sözünə uyub, bu işin üstündən keçib, Oğuzu boş buraxmaqla yanlışlıq yapdığını duymuşdu. "Düz deyir gəlin! Ulu ruhlar bənim də, elin də üstündən çəkildi. Oğlum təkcə inancımızın yox, uluğturuğumuzun da düşməninə çevrildi. Dün xatunla mən bilirdik. Bu gün qardaşlar, buyruqlar, gənəşçilər, qaravaşlar bildi. Yarın bütün el biləcək. Üstümə sel gəlir. Bu gün durdurmasam, sonra gec olacaq".

Sözə qardaşları qarışdı. Güz xan dedi:

- Ulusumuz bu yolda qan töküb. Yer üzündə bayrağımızın uca olduğu yüzillər boyu bütün törəmələrimiz bu yolda baş qoyublar. Bu bir qız söhbəti olsa, keçilər. Yüz-yüz qız qurban olsun Oğuza! Ancaq dədələrimizin, yerin-göyün ruhu inciyər bizdən. Yol bul, Böyük xaqan! Bulmasan hər kəs ayrılıb öz yoluyla gedər. Bölük-bölük olub başqalarının köləsinə çevrilərik.

Kür xan dedi:

- O bir ordubaşıdır. Döyüşə ordunu siz yox, o aparmalıdır. İnanıb göndərsəniz necə olacaq, inanmasanız necə?

Qara xanın baş gənəkçisi Ulutürk belə dartışmaları çox görmüşdü. Axarı öncədən duyurdu. Qardaşlarının ağzından qan iyi gəldiyini sezəndə, özündən xəbərsiz, gözündən yaş süzüldü.

Xaqanın əli qalxdı:

- Oğlum ərgənlik yaşına çatanadək boyunu oxşadıq. Soyumuzun gələcəyi kimi sevdik. Yaşıdlarından seçilirdi. Güclü, anlayışlı, xaqanlığa yetənəkliydi. Sonra yeklər könlünə yol tapıb, duyuq düşməmişik. Mənim yerimə olsaydınız nə yapardız?

Qardaşlar durumu anlamışdılar. İllərlə görüb götürmüşdülər. Bununla belə, indi bu gənəşmədə söz deməkdən çəkinirdilər. Dolayı yolu seçdilər. Kür xan dedi:

- Mənciləyin qardaşım oğlunun bağışlanmaz suçundan da keçərdim. Ancaq sən baba kimi yox, el, inanc başqanı kimi dəyərləndir.

Qara xan "ax, yolsuz qardaş!" deyə düşündü. "Quruca sözlə də tutmadın Oğuzu. İnanc bir qarmaqdır. Məndən sonra taxta çıxmaq istəyi quduzlaşdırıb səni. Öz belindən gəlsə, belə ürəklə danışmazdın". Belə düşündü, ancaq belə deyə bilməzdi. Araya Aybikə girdi:

- Sözə qarışmaq istəmirəm. Ancaq bu iş atayla-oğulu üz-üzə gətirər. Qan tökülər, qurduğumuz xaqanlıq dağılar. Oğuzun ağzını aramadan, təkcə gəlinlərinin sözüylə yetərlənmək yanlışdır. Çapar göndərək, Oğuz gəlsin, onu da dinləyəlim.

Elə bil bu sözü gözləyirdilər. Aybikə sözünü qurtaran kimi dışarıdan soraq verdilər:

- Çapar gəldi!

Aybikənin ürəyi qopdu. Gəlişi xəbər verilən çaparın uğur gətirməyəcəyini anladı. "Oğuzdan gəlir. Onun sözü gecənin dartışmalarını kəsəcək". Gözü qaraldı. Taxtın arxasına söykəndi. Qara xan soruşdu:

- Kimdəndir çapar?

- Qam Atadan.

Ürəyinə nəsə dammışdı. Yaxınlarının arasında dinləmək istəmirdi çaparı.

Qam Atanın bükülü-möhürlü dəri bitigini açdı, ötəri göz gəzdirdi yazıya, oxumağa durmadı, çapara:

- Sən anlat, - dedi.

Çapar anlatdı:

- Oğuz gəldi, Ata mağaranı dağıtdı, ora sığınmış ulu ruhları incitdi, bütləri, iyələri əzib, Qam Atayla bəkil bəylərə: “Tək Tanrıya tapının!” - dedi.

Qara xanın rəngi əlində tutduğu aşılanmış dərinin rəngi kimi ağardı:

- İndi hardadır Oğuz?

- Issıkdan keçib Alatau yaylalarına gəlir.

- Qam Ataya çatdır. Oğuz suçunun qarşılığını alacaq, üzülməsin. Ata mağaradan çıxmasın. Bəkillərini artıracağam Ərkonun. Bu gecə dincəl, yarın dönərsən, Oğuzla üz-üzə gəlmə!

Aybikə oğlunun bitdiyini anladı, bağrının başından ağrı qopdu.

Qara xan qapıçıya üz tutaraq:

- Yabqulara, şadlara, tarxanlara de, dan üzü toplaşsınlar, - dedi.

Sonra qardaşlarına söylədi:

- Oğuz duyuq düşməsin! Qarşı gedibən dəpələyərik[118]. Elin inanc yerini, ziyarətgahını dağıtmaq bağışlanmaz! Oğuz bitməsə, el bitər!

Aybikənin başı döndü. Gəlinlərin üçü də birdən qapadı üzünü. Banuyla Tərçiçək öc, qisas almaq istəsələr də, ölüm gözləmirdilər.

---

[118] Dəpələmək–öldürmək

Aytac hıçqırıb saraydan qaçdı.

Bir havur sonra gecə qaranlığında ordadan bir atlı çıxdı. O, Aytacın sözünü Oğuza çatdıracaqdı: "Gəlinlər səni satdı, babaları yağı kəsildi, xaqan sənə qarşı gələcək. Öldürməyə... Üz-üzə gəlmə! Yol bul! İş soyuyanadək, qaç qurtar!"

## ÇİN BARMAĞI

Çin elçilərinin biri gəlib, biri gedirdi. Burun soxmadıqları yer yoxdu.

Son gələnlər Qara xana quzeylilərin arası kəsilməyən basqınlarından, axınlarından gileylənir, dolayı yolla bu işi Xaqana bağlamağa çalışırdılar. Xaqan "Biz Çindən uzaqdayıq. Axınlar bizdən deyil. Yağılarınızı bulun! Onlardan qorunun!", - deyirdi.

Karvanlara saldıranlar artmışdı. "Özləri çapıb, ara qarışdırırlar" düşündü Qara xan, səsini qaldırdı:

- Bənim bayraqımın kölgəsi düşən yerlərdə sizin karvanlar toxunulmazdır. Dəmir aparan dəvələrimizlə birgə yüyürürlər. Ərənlərimiz qoruyur onları. Nə olursa, Turan çölünü keçəndən sonra olur, ora əlimiz çatmır. Əfqan yaylalarında, Xorasanın o üzündə sözünə güvənilməyən tayfalar ayaq açıb, Nerədən gəldikləri bəlli deyil! Bizim yerlərə da yiyələnmək istəyirlər. Yaşayışları düzənsizdir, özününkü-özgəninki bilməzlər. Ata kızına, qardaş bacısına evlənir. Onlar sizin karvanlara soxularaq, gizlicə sizin saraylarınızadək gəlib çıxırlar. Bir gün ipəyinizə gərəkləri qalmayacaq. İpəyin özü bir yana, qurdunu da çalıb aparacaqlar...

Çindəki quraqlıqdan danışdığında, Qara xan türk elində quraqlığın olmadığını ulu ruhlara bağlayırdı:

- Siz hər şeyi Yağmur daşının gücündə görürsünüz. Bizlər daş ələ alıb, cadu eləmərik. Bu, Qamların işidir, xaqan işi deyil! Yer üzü dəyişilir. Bizim çöllər də ildən-ilə verimsiz olur. Bayatlara qarşı gedilməz. Biz də tenqrilərin, çələblərin gözündən düşəndə verimli torpaqlarımız, əkin-biçin yerlərimiz üzünü bozardır. Quraqlığı adlatmaq, çıxış yolu bulmaq olar. Ancaq ruhlardan, onların öc-qisas almaq çılğınlığından qorunmaq olmaz.

Xaqanla elçilərin söhbətləri uzananda, Talas, Sayram, Sığnaq bazarları gülümsəyə-gülümsəyə, hər kəsə baş əyə-əyə gəzən çinlilərin əlindən bezgindi. Girmədikləri deşik qalmamışdı. Hər şeyi alır, hər şeyi satır, hər şeylə maraqlanırdılar.

Qara ruhların ölkənin başı üstünü aldıqını duymuşdularmı? Ya da elə özləri idi qara ruhlar...

* * *

Tülünün evi bir çinli düşərgəsinə bənzəyirdi. Don Xinin yanına hər gün yeni qonaqlar gəlirdi. Qumaş, dava-dərman, qab-qacaq, düyü, darı satıcıları qaravaşların əliylə saraya, ordunun içinə qədər yol tapırdılar. Ancaq alış-verişin ən ilginci gecələr başlanırdı. Ərlərin, ərənlərin üz tutduqları bu yerlər kəndin yan-yörəsində salınmış, aralıdan seçilməyən evlərdi. Bu evlərdə Çindən nə zaman, hansı yollarla gəldikləri bilinməyən qızlar ərənlərlə oynaşır, dan yeri qızarana kimi onlara türk qızlarının yaxın buraxmadıqları

“sevişmək” yollarını öyrədir, oxşayır, əzizləyir, ürək-lərini yerindən oynadıb, əllərindəkini alıb çölə ötü-rürdülər. Bu evlər altun toplamaqdan, ərlərin odunu söndürməkdən çox, dedi-qodu yaymaq, türk ərlərin-dən söz qoparmaq yuvalarıydı, birbaşa Çinin impera-tor sarayıyla bağlıydi.

Bu hörümçək torunun ip ucları, olsun ki, Ata mağaraya, saxlanc, xəzinə arabalarının gözətçilərinə-dək gedib çıxırdı.

Axşamlar sarayda qaravaşlar içib keflənmiş bəy-lərin arasından sıyrılıb təmiz havaya çıxmaq, dincəl-mək adına qarovulçuların qucağına atılır, Çin arağıy-la başlarını dumanlandırıb içlərini sökürdülər. Qara xanın Oğuza qarşı yürüşündən bir neçə gün öncə Tü-lü ilə Don Xi yoxa çıxdı. Orda civarındakı evlərin qa-pıları qapanmışdı. Bazarlardakı çinlilər iy dəymiş cü-cülər kimi birdən-birə yoxa çıxmışdılar.

## ANA YUXUSU

Gecə Aybikə uyğusunu qarışdırdı: geniş bir dərənin ortasında dayanmışdı. Dörd yanı sıra qayalardı. Əllə yonulmuşcasına hamar, cilalı, dim-dik... Gözlənilmədən bu qayaların üstündən bir baca açıldı. Qovulmaqdan təntimiş bir at burdan çölə atıldı, yarıya qədər bacadan çıxıb, eləcə boşluqdan asılı qaldı. Qabaq ayaqları havada yellənirdi. Qayadan üzü aşağı, nə zamansa gur suların çağladığı dərəyə atılmalıydı. Di gəl, çayın quruduğunu, aşağıda, göl yerində iti uclu, sivri daşların diş ağartdığını görüb çabalayır, atıla bilmirdi. Aybikə tanıdı. Oğuzun ağ ürgəsiydi. Ağ kəpənəyə bənzəyirdi. Sonra birdən ağ ürgənin sağından-solundan başqa atlar sıçradılar. Görünür onlar Oğuzu qova-qova gəlmişdilər, indi ona yetəndə özlərini saxlaya bilməyərək uçurumun dibinə tullanırdılar. Ulu Tanrı, atlar yumalanmadan düz torpağa düşdülər, ayaqları dəmir mıxlar təki dizəcən torpağa sancıldı. Bir neçəsi sivri daşlara dəyib paran-parça oldular. Tanıdı bunları da. Qara xanın və qardaşlarının atları idi. Elə bu hallarıyla da daşa döndülər. Yalnız bundan sonra Oğuzun atı duruş gətirə bilməyib uçuruma tullandı. O, göydə aşmadı, necə var eləcə, sanki quş kimi süzərək endi, ancaq ondan öncə torpağa san-

cılan atlara çatanda birdən uçuşu dayandı, onların üstündə yüngülcə, şuxluğunu pozmadan, elə bil, qanad açaraq kəpənək kimi süzməyə başladı.

Aybikə qan-tər içində oyandı. Yerindən durdu, dan üzü yola yığışan Qara xanın qarşısını kəsdi:

- Uyğum qarışdı. Bu yolda uğur görmürəm. Bəklə Oğuzun qayıtmasını! Ara quvlamalarına uyma! Getmə! Getsən, məni öldür, ondan sonra get! Qaba başlığın malı durmaz, deyiblər. Bu iş qabalıqla, tələm-tələsik çözülməz. Oğluna qarşı orduyla necə gedə bilirsən? Biz olmayanda sənin yerini tutacaq, xaqan olacaq oğluna oxlamı, qılınclamı saldıracaqsan? Qara qanınımı axıdacaqsan onun? Başınımı kəsəcəksən? Öz əlinlə öz yurdunumu batıracaqsan? Ayıl! Ayıl! Bilməzsənmi, onun da yaşamı gərdun[119] yazana, alın yazısına bağlıdır! İpi qırılmayıbsa, basılmaz! Sənmi basılacaqsan onda? Düşündünmü bunu? Tenqri verməyincə, ər bayımaz[120]... Duydunmu?

Qara xan dedi:

- Sənin Tanrın Oğuzun qabarması üçün hər işi yapdı. Gürbiz[121], ərdəm deyübən öyündüyüm oğul asi[122] kəsildi, qənim oldu: mənə, ulusa, inancımıza, törəmizə... Seçim onundur: ya o, ya ulus! Başqa seçənəyimmi qaldı? Söylə mənə! İndi südünü suçlu bilməyib də, məni biləcəksən? Törəbilməz oğluma keçsəm, el nə deyər bənə? Xaqan oğludur deyə, mənim varisımdır deyə yurdun törələrinə qarşı çıxa bilməz. Sən də anla!

---

[119] Gərdun — tale

[120] Bayımaz — bay olmaz, yüksəlməz

[121] Gürbiz — qəhrəman

[122] Asi — düşmən

Atlandı. Savaş, axın olmayanda döyüşçülər evlərinə, yurdlarına dönürdülər. Xaqanlıqda yalnız seçmə alplar qalırdı. Onlar yaraqlanaraq xaqanın işarəsini bəkləyirdilər. Borular səsləndi, çəri[123] tərpəndi.

* * *

Aytacın çaparı Oğuzu, dəstəsi ilə birgə, Çu sızrasında tapdı. Babasının ona qarşı gəldiyini eşidəndə, xaqan ordusunun ən saçmə döyüşçüləri olan yoldaşlarını, atlıbaşılarını səslədi. Durumu gizlətmədi:

- Babam əmilərimlə birləşib üstümə gəlir. Qoşun onlara bağlıdır. Sizlər də babama bağlısınız. O xaqandır, töröni qoruyur. Mən də inancımı babama vermərəm. Gərəkirsə, babamla da savaşaram! İstəyirsiniz qalın, istəmirsiniz siz də babamı qızışdıranlara qatılın. Çağrı[124] yazan alın yazısından qaçılmaz!

Ərənlər bir ağızdan:

- Biz səninləyik, Oğuz xan, - dedilər.

Oğuzun ən yaxın dostlarından Beyrək bəy:

- Biz bu güclə xaqana qarşı dura bilmərik, Oğuz! - dedi. - Eldə səni sevənlər, babandan, qayınatalarından bezgin adamlar çoxdur. Soraq göndərək, xas bəylər daranıb[125] gəlsinlər. O çağadək xaqanla üz-üzə gəlməz, yayınarıq.

Söz ağlına batdı Oğuzun.

Yurdlara çaparlar getdi.

---

[123] Çəri — qoşun, əsgər

[124] Çağrı — fələk

[125] Daranıb — seçilib, yığılıb

Bir neçə gündən sonra Oğuza ürəkdən bağlı olan, onu sevən bəylərin ayağı açıldı. Uzaqdan-yaxından gəlirdilər.

Başındakı igidlərlə neçə-neçə savaşdan çıxmışdı. Heç biri ölümdən qorxub-çəkinməmişdi. Onların arasında güclüydü, əlyetməzdi. Ancaq indi qorxurdu. Canına tər gəlirdi. Bozkırda[126] babasıyla üz-üzə gələcəyini başından çıxara bilmirdi. Bunu istəmirdi. Di gəl, alın yazısının pozulmazlığını da bilirdi. Ulu Tanrıya bağlıydı, qısa yaz yağışından sonra yalablayan günəş, yuyulub təmizlənmiş çöllər ölüm yox, dirilik havasıyla doluydu. Təkcə xaqanlıq olsa, uf demədən, hər şeydən əl çəkərdi. Ancaq indi boynunda ilahi bir tapşırıq vardı. Qaçmaq - öz Tanrısından üz döndərmək sayılardı.

Düşərgə qalxıb tərpəndi, yollar boyu savaşsız darıxan ərgənləri obalardan yığa-yığa irəlilədi. Ancaq babasıyla üz-üzə gəlmədi. Günü-günə satmaqla Qara xanın ürəyinin yumşalacağını düşünürdü. Qara xan qulağuz[127] salıban onun yerini öyrəndi, ardınca düşdü. Baba qovdu, oğul qaçdı...

Oğuzun igidləri Qara xan çərisini dağıtmaq istəyilə yanırdılar.

Qara xan qoca qurddu. Bütün yolları, çölləri əl içi kimi bilirdi. Oğuzun ondan qaçacağını duyub, izləməkdən əl çəkdi. Qulağuzların sözüylə Oğuzu uzaqdan-uzağa göz altında tutdu, oğlunun bəkləmədiyi, qaça bilməyəcəyi bir bərədə yerdən çıxmış kimi qarşısını kəsdi.

---

[126] Bozkır — çöl

[127] Qulağuz — bələdçi, kəşfiyyatçı

Oğuz öndə əmilərini, onların başında şadları, minbaşıları gördü. Arxada, xaqanın savaş alanına göz yetirməsi üçün yüksəkdə yer seçmiş qoruyucularının başı üstündə, sözsüz ki, babasının da bulunduğu təpədə elin bayrağı dalğalanırdı. Babası qurd təkin pusqudadır. Gözləyir, Oğuz basılanda özü gəlib qılıncını oğlunun boğazına qoyacaq...

Oğuz çocukluğundan bəri, babasıyla birgə onlarla döyüşdən keçmişdi. Heç birində belə uçunmamışdı. İndi yəhərdə otura bilmirdi. Ya onu, ya babasını aparacaq bu savaşdan qurtarmanın yollarını arayırdı. Son sözü Tanrıdan bəkləyirdi... Savaşa atılmağa tələsən yoldaşlarısa onun ağzına baxır, nə deyəcəyini gözləyirdilər.

Bu anda Oğuzun əli qalxdı.

- Savaş olmayacaq! Haydı, arxamca!

Ərənlər könülsüzcə babasıyla birgə Oğuzun da bildiyi dərəiçi, dar cığırla uzaqlaşan Oğuzun ardınca qoşdular.

Qara xanla qardaşları çaşıb qalmışdılar. Öncə bunun bir tələ olduğunu düşündülər, Oğuzun başqa bir yonlə qayıdacağından qorxurdular. Dörd yana atlı göndərdilər. Oğuz yoxdu, getmişdi, göyə çəkilmişdi.

Beləcə, gecə-gündüz dincəlmədən İnci çayınadək gəldilər. Oğuz tək babasını yenməklə, əmilərini diz çökdürməklə işin bitməyəcəyini anlayırdı. Yəni savaşda birinin ölüb, birinin öldürməsiylə iş bitməyəcəkdi. Bu, o qədər də çətin deyildi. Oğuza görə inciklıyin kökündə Tanrı inancı dayanırsa, düyünü də o özü çözməlidir. Di gəl, bu iş saraydan yox, elin-günün içindən başlanmalıdır.

İnancına tapınan, tanrıçılığı yol seçənlərin bir bölüyünü İnci boyuna, İkiçayarası ellərə, Aral çevrəsinə göndərdi. Qara qılıq[128] deyilən, əli işdən ayrılmayan xalqın içində yayılacaq bir inancı savaşda da qoruyacağına inanırdı. İnsanların almadığı, tutmadığı bir inancı savaşla qorumaq anlamsızdı. Ulus içində tutulan inancı isə savınmaq artıqdı, bu işi ulus özü görəcəkdi.

İlk olaraq İncinin aşağı axarında, böyük qum çölünün qonşuluğunda, əski bir qalada bütün əhali: "Biz sənin inancının quluyuq" deyib onu seçdilər.

Aylarla sürən qaçdı-qovdunun sonucunda Oğuz aran-yaylaq bilməyən oturaq, əkinçi-biçinçi kişilərin, budunun - millətin, əhalinin yoxsul bölümünün inanca saraydan seçkin bir baxışla baxdığını gördü. Onların bütü də, tanrısı da torpaqdı. On yerə əyilməkdənsə, bir Ulu Tanrıya tapınmaq ürəklərindəndi. Zatən əvvəli-sonu olmayan yüksək bir torpaq bilgisi alan bu kişilər ağac, çamur bütləri yapmaq, gəzdirmək işi bacarmır, buna baş qoşmurdular. Bütlər daha çox sarayların işinə yarayırdı. Əkinçi-biçinçi kişilər quştək azaddılar, yaşamlarını göyün günəşinə, buluduna, yağışına, çayın suyuna borcluydular.

Ayaq basdığı hər yer Oğuzun sözünün gücü qarşısında susur, ona inanırdı. Ona olan sayqının, sözünün anında tutulmasının, onu dəstəkləyənlərin gündən-günə artmasının bir səbəbi də kişilərin yaddaşıydı. Sarayların, qamların, getdikcə, daha bəzəkli yapdıqları iyələr, anlamını bilmədikləri, ancaq tenqri

[128] Qara qılıq — qara camaat, xalq

adıyla tanıtdırılan yapma bütlər, çələblər onlara bostan içində qoyub, quş qorxutduqları oyuqları, quşqorxudanları andırırdı. Əski çağları unutmamışdılar. O caqlar bu büt düşkünlüyü belə yayqın deyildi. Çöldə günəşdən, aydan başqa, asılı olduqları bir şey yoxdu. Yaşam boyu torpaqdan, oddan, sudan, Aydan, Gündən güclü nə görmüşdülər ki...

Bölgədən bölgəyə bütlərin görünüşü də dəyişilirdi. “Yaradan dəyişilməz ki!” - Belə düşünənlər çoxdu. Bir yandan da büt olayının yayqınlığına daha çox yurd dışından gələnlərin can yandırdıqlarını görürdülər. Oğuz xan isə gələcək xaqandı, sözündən el birliyi, kişilərə sayqı havası vururdu...

Oğuz onlara yeni, yapma, kənardan gəlmə bir nəsnə vermirdi. Ulusun əski, unutdurulan inancını yada salır, Tək Tanrının tək ulusunu bölmək, parça-tikə etmək istəyənlərin qarşısını kəsir, əprimiş ruhları cana gətirirdi.

İnci boyunca, elin içində də, çölündə də tanrıçıların sayı ağlagəlməz bir sürətlə artırdı.

Bozkıra alov düşdümü, söndürmək olumsuz işdir.

Yalnız indi Oğuzun ürəyi yerinə gəldi. Bundan sonra babasının əliylə ölmək Tanrıya qovuşmağın ən gözəl yolu, mutlu bir qədər olacaqdı. Bunu duyunca “daha qaçmaq yetər!” deyib babasıyla, əmiləriylə üzüzə gəlməyə tələsdi.

## QANLI BİR SAVAŞ OLDU

Dünənədək bir yerdə olan, omuz-omuza odlardan keçən, düşmən bağrı yaran, hər biri qoyun sürüsünə düşmüş qurd təki neçə yad qoşununu dağıdan, çaylar adlayan, dağlar aşan, ölkələr alan, bir kökdən, bir boydan gələn alp ərənlər, qohum-qardaş bir bölüyü babanın, bir bölüyü oğulun çiynində, əlsiz-qolsuz, atsız-arabasız, cansız-cəsədsiz qalanacan vuruşdular.

Qara xan savaş alanında ölü düşən igidlərini gördükcə: "İt südü əmmiş! Qansız oğul!" deyərək söyürdü. Oğuz köksündən oxlanan yar-yoldaşını gördükcə, "qudurmuş baba!" deyib qınayırdı. Qara xan əlində olsa göyləri də, Oğuzun Tanrısını da yandırıb yaxardı. Oğuz yer üzünün bütün bütlərinə nifrət edir: "Qırıb qurtara bilmədim onları", - deyə heyifsilənirdi.

El parçalanmış, qoşun qırılmış, güc tükənmişdi. Bu savaşda ən çox çalışıb, at qoşan Güz xanla Kür xandı. Orxan gəlməmişdi, yaylağa gedən köçün başında dayanmışdı. Əski qaynataları Oğuzla üz-üzə gəlmək, hər biri öz öcünü almaq istəyirdi. Ancaq yeniləcəklərini duyunca qardaşlarını ortada qoyub qaçdılar. Qara xan bunu görəndə on qat artıq qəzəblə özü Oğuza cumdu. Oğuz savaşdan yayındı:

- Bu, Tanrının iradəsidir, baba! Yeni yolu başlanmalıdır ulusun! Yer üzünü bu yanlışlıqlardan qurtarmaq mənim boynuma düşüb! Doğmalarımızın, yaxınlarımızın ölüsü üstündən keçməli olsam belə... Göylərə qarşı gedə bilməzsən. Mən suçsuzam! Kəndi savçılığını mənə verən var. Tanrıya tapın! Əl çək yalançı çamur bütlərdən, dönək əski gözəl günlərimizə! Xatun anamın göz yaşına qıyma! Mən baba ölütçüsü olmaq istəmirəm!

Qara xan bağırdı:

- Tanrı səni yurda ölütçü göndərdi. Başını əlimlə kəsməsəm el məni bağışlamaz!

Qılıncı siyirib bir də Oğuza cumdu. Oğuz əli qılıncın qəbzəsində qımıldanmadan gözləyir, ata əliylə gələcək ölümünün sevinci içində gülümsəyirdi. Amma bu anda Oğuzun ərənlərindən birinin qarğusu Qara xanın köksünə sancıldı. Oğuz bağırdı:

- Nə yapdığındı, alçaq hərif!

Ancaq iş-işdən keçmişdi. Qara xanın qoşunu pozulub pərən-pərən düşdü. Əmisi uşaqları qızlı-oğlanlı eldən baş alıb getdi. Oğuza qarşı gələnlər gecə-gündüz deməyib Qaraqoruma yön aldı. Altaydakı əski yurdlara, Selengə nəhri və Kadırqan yaylalarına doğru çəkildilər. Ulusun qara gunlərini, soyların üzünü qaraldacaq iç savaşın ağrısını min ilin o üzündə doğulanlar da anacaq, yanacaq, söyləyəcək, qınayacaqdılar ...

* * *

Oğuz ordusunu çəkib, döyüşdən diri çıxmış yoldaşlarıyla yurda döndü.

Başda iki atın arasından asılmış keçənin üstündə babasının ölüsü gedirdi. Döyüşdə ayağının altını görməyən Oğuz atını babasının arxasınca sürə-sürə gözünün yaşını saxlaya bilmir, onu itirdiyinə yanır, anasının qarşısına necə çıxacağını düşünürdü. Başqa bir duyğu da ona "alın yazısından qaçılmaz" deyirdi. "Tanrının yazısından, göyün yarlığından qaçılmaz. Babam ömrünü başa vurmaqdaydı. Eləcə günlərin birində Canalan əlindən tutub aparsa, mən də dinməzcə, quzu təkin taxtda otursam sonradan bir olan Tanrı yolunda savaşa qalxmağımı kimsə anlamazdı. İndi isə mənim bir inanc savaşçısı olduğumu, bu yolda babamı da ayaqlayıb keçdiyimi hər kəs bilir. Babasına uymayan Oğuzun kiməsə yumşalacağı ağlasığan deyil, - söyləyəcəklər. Bir babanın getməsi ilə Tanrının, ulusun yolu təmizlənirsə, ruhu məni bağışlar."

* * *

Aybikə xanım dərd geyib, ağrı bağlamışdı. Bu savaşda barışıq olmayacağını bilirdi - ya ər, ya oğul... İkisindən birinin öldü sorağını gözləyirdi. Çin xaqanının qızıyla evlənmədən, qonşunun istəyini gözündə qoyan, onu seçən, ondan başqa kimsənin üzünə baxmayan sevgili ərinin ölümünü eşidəndə yandı, şivən qopardı. Yeri-göyü, Tanrını suçladı. Oğuzun ona təskinlik vermək istədiyini görəndə, dişi qurd kimi qabardı:

- Əfi yılanlar kibi, ətənəsini dişləyən köpək kibi, vəhşi qəzəbini cilovlamayan aslan kibi, ac qurd kibi, qudurmuş dəvə kibi özünüzü qırıb tükətdiniz. Yazıqlar sizə! Elimizə-günümüzə yazıq!...

* * *

Elin yaxıb - yandıran ağıtcıları, yodçular[129] gəlübən günlərlə ağlayıb-sıtqadılar. Aranla dağ arasında, köçün hər il yaylağa qalxdığında, dan ertə xaqanın onurla dayanaraq günəşi salamladığı aşırımlardan birində Qara xanı torpağa quyladılar. Oğuz gəlib bir kürək torpaq tökdü. Hərə bir torba torpaq gətirdi, bir təpə dikəldi. Sonra yolun üstündə atlıların atdıqları daşlar qalaqlandı.

"İllər keçəndən sonra bu daş təpəciyə də boyun əyəcəklər", - deyə Oğuz acı-acı düşündü.

---

[129] Yodçu — matəmçi

## XAQANLIĞIN İLK İLLƏRİ

Yayın ortasında Qaracuq yaylasında Oğuz xaqanlığı ələ aldı. Öncə el başçılarının tanıqlığı ilə sarayda taxtaçıxarma şöləni oldu. Xaqanlıq bayrağı, davul və damğalar[130] verildi.

Birinci altunbaşlı al xaqanlıq bayrağı gəldi. Oğuz bayrağı öpüb altından keçdi.

Sonra qurd başlı, altun işləməli döyüş bayraqları gəldi.

Sonra altun sağanaqlı[131] xaqanlıq davulları gəldi.

Sonra tək-tək saxlanc-ağuluq arabalarını, sandıqları göstərib bilgi verdilər.

Oğuz xan gələnək üzrə qutsal Yağmur daşını da görməli, əlinə alıb, qamların tanıqlığıyla onu yalnız iyi amaclarla, el yolu, el törəsincə qullanacağına and içməliydi.

Şölənə toplaşanlara dedi:

- İndi də Tanrı daşı gətiriləcək!

Bu boyda kişilərdən tək Oğuz bu daşın, eldə deyilən kimi, Cadu daşı yox, Ulu Tanrının yerə endirdiyi müqəddəs ildırım daşı, göy daşı olduğunu bilirdi.

---

[130] Damğa — möhür

[131] Sağanaq — çərçivə

Ağuçu[132] getdi, gəlmədi. Az ötmüş onu arabaların arasından tapıb gətirdilər. Özündən getmişdi.

Yağmur daşı yoxdu! İtmişdi! Oğurlanmışdı!

Ağuçu əsə-əsə dedi:

- Bir neçə gün öncə özüm yoxladım. Sandıqda, öz yerindəydi, xaqanım!

Sonra Oğuzun ayaqlarına sərildi:

- Deyin, vursunlar mənim başımı... Ürəyimə dammışdı! İyrənc çinlilərin bir gün ora əl uzadacaqlarından qorxurdum. Oğurlayıblar Cadu daşını! Yaradan üz çevirdi bizdən...

Bu sözlər yalablayıb[133] çaxdı. Hamı donub qalmışdı. Qulaqlarına inanmaq istəmirdilər. Bu, ulusun ölümü deməkdi. Oğuz xan öncə bu sözün şöləni pozmaq üçün deyildiyini düşündü. Ancaq acı da olsa, daş itmişdi, yoxa çıxmiışdı. Xaqanlıq şöləni yasa dönmüşdü.

Oğuz xaqan Çinə gedən bütün yollara atlı dəstələri saldı. Daş tapılmadı.

* * *

Yayın axırında Oğuz altun işləməli günlüyü gündoğana açılan, doxsanbaşlı, üç min kişilik çadırını Qaracuğun gül-çiçəkli çəmənində açdırdı, uzaq-yaxın ellərdən gələn bəylərin, elçilərin, qonaqların da, qatıldığı qurultay çağırdı. Elə-günə soraq saldı. Qırx masa qırx sıra düzüldü. Aşlar yeyildi. Babasından sonra könlü açılmasa da törəni poza bilməzdi. Oğuz xan bəylərə, elə-günə öz düşüncəsini bildirərək belə hökm verdi:

---

132 Ağuçu — xəzinadar

133 Yalab — ildırım

- Mən sizin üzərinizə xaqan oldum! Ox-yayımızı, qılınc-qalxanlarımızı ürəklə əlimizə alalım. Önümüzdə uğurlu yollar açılsın. Oxlarımız yayından uçanda göyün üzünü tutsun. Dəmir qarğularımız orman kimi olsun. Yurdumuzun irmaqları, dənizləri çağlasın. Günəş bayrağımız, göy çadırımız olsun...

Oğuz xan, baxalım, sonra nə dedi:

- Bəylər, qandaşlar, qardaşlar, qonaqlar, bilin! Mən, Oğuz xan, yer üzünə böyük Yaradıcının elçisi olaraq gəldim. Yaradan birdir, hamımız onun törəməsiyik. Onun seçiminə, onun savçısının istəyinə boyun əyərsinizsə, uluslarınız bizim başımıza toplanarsa, başqaları da əl verib el olarlarsa, ulu göylərin altında insan oğlu düzən tapar, dirçələr, düzlükdə, anlaşma içində yaşar, yaradılan bir-birinin qanını tökməz, hər kəz öz yuvasında mutlu olar. Hər şey böyük Yaradana bağlıdır. Buna qarşı çıxanları yola gətirmək də Tanrının əmridir. Bunu da bilin! Türkün Tanrısından böyük yaradan, türkün gücündən böyük güc yoxdur! Bunu da anlayın! Göyün altında, yerin üstündə bizim düzənimizi kimsə poza, adımızı kimsə batıra bilməz! Kim bu düzəni pozmağa qalxarsa, ona qurtuluş yoxdur. Gök Tanrı yardımçınız olsun!

Oğuz xaqan elçilərlə dörd yana, bütün qonşu ölkələrə buyuruq[134], bildirgə yazıları[135], məktublar göndərdi. Bu məktublarda yazılırdı: "Mən türk ulusunun, eli-gününün xaqanı oldum. Yer üzünün dörd yanının da xaqanı olmam gərəkir. Mənə bağlanmağınızı, itaət etməyinizi istəyirəm. Hər kim mənim sözümə baxıb

[134] Buyuruq — fərman

[135] Bildirgə yazıları — məlumat

durarsa, əmrimə boyun əyərsə pay-ürüşünü, hədiyyələrini verib, onu dost tutaram. Kim mənə baş tutarsa[136], ordumu çəkər, başını üzər, onu yox edər, öylə də yaparam! Mən öncə gördüyünüz yer xaqanlarından birisi deyiləm. Yerləri-göyləri yaradan, sizlərə- bizlərə yaşam verən, bütün yaranışların başlanqıcı, Böyük Baba, eşi-bənzəri olmayan, Təkcə, Bircə, Ərkli, Görklü, Ulu Tanrının yerə, bütün xalqların üzərinə göndərdiyi Yalavacam! Min illər boyu insan oğlunu düz yoldan sapındıran, üz-üzə qoyan yapma törələri silmək, gözümüzü gəldiyimiz göylərdən ayıran, adamları kiçildən, Tanrı adına kölgə salan bütləri, tözləri, çələbləri, qondarma tapınaqları yıxıb-yaxmak, yer üzərində tanrısal düzən qurmaq mənim vəzifəmdir. Bunlar Tanrının mənə verdiyi tapşırıqlardır! İnanan itaət edəcək, inanmayanı itaət etdirəcəyəm!"

Bundan sonra Oğuz xaqan son savaşda ona yardım etmiş Uyğur, Kayı ellərinin bəylərini ayrıca topladı. Bütün yürüşlərdə birgə olacaqlarını razılaşdılar. Qalmaqalda parçalanıb dağılmış ordu toparlandı. Atlıbaşılarını yenidən seçdi. Ağır günlərdə ondan uzaqlaşmamış əmisi, eyni zamanda qaynatası Orxan ordu başçısı oldu. Qam Atayla danışaraq, onu tək tanrıçılığa inandırmağa, Ata mağaranı tanrıçılıq ocağına çevirmək, daha güclü qorumağ üçün danışıb razılaşmaq işini Uslu Xocaya tapşırdı və onu Xantenqriyə göndərdi.

Yaxın yerlərin tanınmış dəmirçilərini toplayıb, məclis qurdurdu, onlara ziyafət verib ağırladı. Türk ellərində o çağlar dəmirçilər də çoban və əsgərtək üst

---

[136] Bənə baş tutarsa — mənə qarşı çıxarsa

kişilərdi. Xalq arasında, hakimiyyət məqamında özəl yerləri vardı. Dəmirçilər gecə-gündüz çalışıb orduya gərəkən qılınc, ox ucu, mızraq, balta və başqa döyüş ürünlərini yeniləşdirdilər. Ordu təzədən quruldu.

Atlar seçilərək minik və yük üçün olanları göz altına alındı. Arpayla bol-bol yemlətdirildi.

Oğuz xan Çinin saray yanındakı elçisini çağırtdırıb bildirdi:

- Ölkənizin sayqılı imperatoru, dəyərli qonşum və qardaşım özünü göy kişisi sayır. Göy Tanrı, Kök Tanrı yerə bəndən başqa elçi göndərmədi. Ağac, daş, dəri kimi cansız iyələri özünə yaradan sayandan göy kişisi olamaz!. Çin bizim yaxın qonşumuzdur. Orda öz soyumuzdan olan saysız insan var. Xakanlığınızın başında uzun illər bizim qandaşlarımış dayanıb. Sizin sərhədlərinizdən başlayaraq, ən uzaq günbatan ellərinə kimi böyük qobilərin, Çölün bəyi olan, tanıdığınız - tanımadığınız ulusları itaətində saxlayan elimizə üstdən aşağı baxmaq istədiniz. Sizdən dışarıda olanları alçaltmaqdan, əzməkdən, aldatmaqdan, adlarına yalanlar uydurmaqdan yorulmadınız. Bizi yağmaçı, akınçı saydınız. Yetər! Çinin yalanı türkün qılıncından itidir. Biz yalanla ikiüzlülük bilmərik. Qonşumuzu güclü istərik ki, özümüz də güclü olaq. Uzun sürən quraqlığın Çinə gətirdiyi sıxıntı bizi də üzür. Ancaq bu, Tanrının işidir. Əlimizdəki bilgilərə görə türkə Tanrının göndərdiyi Tanrı daşını, elimizin qutsal daşını Çin imperatorunun güdükçüləri çalıb aparıb. Biz savaş istəmirik, ancaq daş qayıtmasa, çöllərin düzəni pozulacaq, axınların qarşısını ala bilməyəcəyik, istədik-istəmədik, bu yürüşlər qarşısında Çin batacaq.

Elçi yağlı dilini işə saldı. Tarixdən, bu gündən, Çin imperatorunun qonşulara xoş münasibətindən uzun-uzadı danışdı. Dəridən-qabığdan çıxdı ki, daşın Çində olmamasına inandırsın. Zatən artıq Çinin daşa ehtiyacı da yoxdur, çoxdan gözlənən yağışlar başlayıb.

Bu xəbər Oğuz xanın bütün şübhələrini dağıtdı: "Türkün daşı sizin başınıza düşsün! Əlinizə keçən kimi Tanrı yağmurunu göndərib."

Elçi gedən kimi Oğuz xan Çin üzərinə yürüşə hazırlıq tapşırığını verdi.

Oğuz xanın Çin imperatoruna məktubu: Çin xaqanı! Eşit, bil! Səndən öncələri, bizə qonşu olan baban da, ondan öncəki ataların da bizə boyun əydi, itaət etdi.

Göylərin- yerlərin yaradıcısı olan ərkli, görklü yücə, bir olan Tanrı bizə türk adını verdi, bizi yer üzünə xaqan qıldı. Tanrı kimsəyə qızanda bizi onun üzərinə göndərdi. Ancaq biz sizin üstünüzə gəlmək istəmirik, qonşuluqda min illər boyu var olmuş ilişgilərimizi qorumaq istəyirik.

Sizi doğru yola, yücə Tanrının yoluna çağırıram. Düz yola gəlməkdən, Gök Tanrı inancına bağlanmaqdan başqa, çıxış yolu görmürəm sizə.

Bir olan Tanrıya sığınarsınız, ellərimiz sonsuzadək ən yaxşı qonşular olaraq, birgə yaşayar. Mən Tanrının elçisiyəm. Tanrını bilən məni biləcək, mənim böyüklüyümü qəbul edəcək. İldə iki kərə bac ödəyəcək, xərac verəcək. Başqa yol arayanlar başlarında iti qılıncımı görəcəklər.

Sözümü tutarsan, buyruğuma boyun əyərsən - öydüyüm uca Tanrı səni də böyüdər!

## TABQAÇ—HİYLƏ YUVASI

Yağmur daşını xəzinə arabasındakı sandıqdan çalan Çin casusları Tülüylə Don Xidən tez qaçmışdılar ordadan. Don Xi: "Tülü bilsə, iş pozular, ərim də olsa, türkdür. Bayat gücünün Çinə getməsini istəməz" demişdi.

Ordadan uzaqlaşandan sonra casuslara bir bölüm çinli alış-verişçisi də qarışmışdı. Çeşidli adlarla türk sarayına, Çin elçisinin yanına gəlib-gedən kişilərdi. Öncə qorxu içində olsalar da, öz ölkələrinə yaxınlaşdıqca üzləri gülür, sevinclərini gizlədə bilmirdilər.

Yolda Günbatandan gələn bir karvana qoşulmaqla izi bütünlüklə itirdilər. Yüzlərlə yolçunun, səyyahın arasında onları arayıb-tapan olmazdı.

* * *

Daş oğurlanan gecə Qam Ata ağır bir yuxu gördü, uyğudan qan-tər içində oyandı. Dan üzü yetirmələrini, başqa qamları başına topladı. "Elin qara günləri başlanır, - dedi, - Qorxunc bir yuxu gördüm. Gördüm, illərlə ara verməyən bir quraqlıq bozqırları külə döndərib. Əsən yellər yer üzünün bu başından o başına kül sovuruntuları daşıyır. Ortada incə bir yaşıl zo-

laq qalır. Onun içində sonu görünməyən bir karvan yürüyür. Quraqlıq yanğısı təkcə bunlara toxunmur. Elimiz-günümüz hər yandan qaçıb, bu karvana qoşulmaq, özlərini qurtarmaq istəyirlər. Sonda görürəm, bu karvan deyil, bir yumağdır. Türk ellərindən uzanan rəngbərəng ipləri sarıya-sarıya Çinə doğru yumalanır. Bu nə idi, bilmirəm. Ancaq yaxşı yuxu deyil! Varmı elə bir karvan? Kimlərindir? Nə aparır bizdən? Duymamışam! Ancaq durdurmalıyıq onu! Ərkonun bütün caduçularını yığmalı olsaq da, yolları bağlayıb, karvanı dayandırmalıyıq!"

Qamlardan birisi:

- Qam Ata, Ulduzçu Ərqut baba yetməzmi?

Qam Ata nə düşündüsə:

- Olsun! Ulduzçu Ərqut babanı tapın!

Az sonra çiyinlərinə tökülən dalğa-dalğa ağ saçları olmasa, üzündən uşağa bənzəyən, gözlərinin dərinliyindən sanki uzaq bir dünyaya yollar açılan Ərqut baba gəldi. Qam Atanın yuxusu və qorxusunu dinlədi. " Əlimizdən qurtula bilməz o arğış" deyib gülümsədi. Bir yergə Ata mağaraya çəkildilər...

* * *

Karvanbaşı başını itirmişdi. Nə edəcəyini, hara üz tutacağını bilmirdi. Bu yollarla yer üzünün uzaq ellərinə neçə kərə gedib-gəldiyini çoxdan unutsa da, özünü bu yolların ən yaxşı bilicisi saysa da, burda dəfələrlə hər cür çətinliyə düşüb çıxsa da beləsini görməmişdi. Karvanların, arabaların, atlı və piyada yolçuların yüz illər boyu döyüb daşlaşdırdığı, üç-dörd

arabanın yanaşı keçə biləcəyi el yolu birdən-birə yoxa çıxmışdı. Dirədöydu oyununda olduğu kimi, kimsə bu yolu qayıştək ayaqları altından dartıb aparmışdı. Günün çıxdığı yer də, batdığı yer də göz önündə, ancaq hara gedəcəyini bilmir. Elə bil, göydə ulduzların da yeri dəyişilib. Bura Tanrı dağlarıyla Çin arasında sonsuz bir qum çölüdür. Sağ əldə, uzaqlarda olsa da ancaq hər halda görünməli olan Tanqutun qarlı təpələri də buludlara qatılıb, əriyib gedib. Yol harda qaldı bəs? Karvanın düzəni pozulmuş, dəvələr, atlar, qatırlar, alış-verişçilər, yol boyu onlara qoşulan yolçular və Yağmur daşını çalıb onlara qoşulan oğrular bir-birinə dəymişdi. Neçə kərə gecə ulduzlara baxıb irəli yürümüş, günəş doğanda yenə öncəki yerə gəlib çıxmışdılar. Dözüm də su kimi tükənmişdi. Artıq karvandakıların hər biri yaradanın onlardan üz döndərdiyini anlayırdı. Qablardakı son damla sular da içilmiş, adamların dodaqları keçdikləri çöllərtək cadar-cadar olmuş, bədənlərini yara basmışdı. Yaşlı, uzun yollar keçmiş, yürüşlər görmüş kişilər atların, dəvələrin qarnında dəriyə yaxın olan damarları deşib ordan süzülən qanla susuzluqlarını yatırmağa çalışırdılar. Ancaq bu, tezliklə ürəklərini vurdu, karvanı xəstəlik bürüdü. Bu azmış kimi, on-onbeş gün sonra birdən-birə karvanın yan-yörəsini qurd sürüləri bürüdü. Adamlara, heyvanlara yanaşmır, özləri də ard-arda düzülüb, elə bil, qəsdən izləyirdilər ki, karvanı bu ölüm çevrəsindən dışarıya buraxmasınlar.

Bir neçə gündən sonra birdən-birə göy üzü qaraldı. “Havaya bulud, gəldi. Yağış yağacaq” deyə sevinənlər də oldu. Ancaq kökslərinə enmiş başlarını

zorla qaldıranda göyü qara çadır kimi bürüyərək, karvanın üstündə Canalanın kölgəsi kimi fırlanan qara quzğunlardan başqa bir şey görmədilər.

Beləcə karvan sonsuz qum çölündə fırlandıqca-fırlandı, fırlandıqca əridi və sonra qumlar arasında yavaş-yavaş itdi, yoxa çıxdı, batıb getdi. Yağmur daşı da, ona sahibləndiklərinə sevinənlər də karvanla birgə həmişəlik daldı bu qum dənizinin dibinə...

* * *

Çinə gedəndən sonra Don Xinin saraya ayaq açması Tülünün içini qatmaqarışıq duyqu və şübhələrlə doldurmuşdu. Onların əl üstə tutulmasının elə-belə iş olmadığını hiss edirdi. Az keçmiş Don Xinin onu tələsdirməsinin, ordadan qaçaraq ayrılmasını öz elndən qutsal daşın oğurlanmasıyla bağlı olduğunu duydu. Deməк, Türkün gücünü çalmışdılar. Onun öz əliylə olmasa da, yardımıyla olmuşdu bu iş. Elə bil, buzlu suya salıb-çıxartdılar Tülünü. Ayıldı, di gəl, neyləyəcəyini bilmədi. Söz açılsa, çinlilər onun duyuq düşdüyünü anlasalar ölümdən qurtula bilməzdi. Susub gözləməkdən, özünü anlamazlığa vurmaqdan başqa, bir yol görmürdü. Bununla belə, Don Xiyə sezdirmədən, gizlicə hər yana əl atıb yağmur daşının yerini öyrənməyə çalışırdı.

* * *

Çin sarayındakı şənlik yavaş-yavaş azalaraq, üzücü bir gözləməyə çevrildi. Daşı gətirməli olan

karvan gəlib çıxmırdı. “Tutub gerimi apardılar, yolda öldürdülərmi? Bəlkə daşın oğurlanması Don Xiylə Tülünün uydurmasıdır?”. Ancaq ordadan, Çin elçisindən gələn çaparlar da onların dediyini demişdilər. Oğuz xan da daşın Çinə gətirildiyini bilir, məktubunda onun qaytarılmasını istəyirdi. Gəlib çatdı-çatmadı, artıq bunu dilə gətirmək olmazdı. “Daş bizdə deyil, karvanla birgə yoxa çıxıb” deyilsə də bu, bəraət olmayacaq, əksinə işin başında dayandığlarını bəlli edəcəkdi. Yasa batıb, itkinin acısını çəkdiklərini aşkar sezdirmək də eləcə. Özlərini heç nə olmamış kimi aparmaqdan başqa, yolları qalmamışdı. Yenidən ara qızışdı, imperator sarayı əvvəlki həyatına qayıtdı. Artıq Tülü tam əmindi: “Daşı gətiriblər!”... Ancaq harda saxlatdırırlar görəsən? Bunu bilmirdi. Bir şeyi bilirdi ki, müqəddəs Tanrı əmanəti oğurlanan türklərin qorxusundan daşı burda, sarayda saxlamazlar.

Bu arada ölkənin güneyindən ilginc soraqlar gəlirdi. İllər boyu gözlənən yağış yağmışdı. Ancaq o qədər çox yağmışdı ki, çaylar daşıb evləri, əkini-biçini yuyub aparırdı. “Demək, belə! Yağmur daşı getdiyi yerdə öz işini görür.”

* * *

Türk içində hər bir ulus bəyinin göz dikdiyi Yağmur daşının Çinə qaçırılması xəbəriylə arı pətəyinə çöp uzandı sanki. El qarışdı. Bu işin sonu savaşdır. Ancaq böyük savaşı gözləmədən, hər kəs öz öcünü almaq niyyətindəydi. Əllərinə fürsət düşmüşdü. Aralarındakı barışığı pozmuş Çinə yürümək, ara ver-

məyən basqılarla onların gününü qara eləmək, Tanrı xoş baxarsa, müqəddəs daşın izinə düşüb ona yiyələnmək arzusuyla yanırdılar.

Şimal-cənub yolları basqınçıların saysız yürüşlərindən ağardı. Hər gün bu yollarla Çinin üstünə yağışdan daha qorxunc olan sellər tökülüb gəlirdi. Yürüşlərin, basqınların axına bənzədilməsi, türk hücumlarının akın adlandırılması da göydəndüşmə deyildi. Bütün Quzey yollarını bağlayan uzun bir daş çəpər çəkmək qərarına Çin imperatoru o çağlarda gəlmişdi.

* * *

Ancaq qonşunun ürəyinə əl atmağın nə demək olduğunu Çinə Oğuz xan göstərəcək, bu gözdən qıl çəkənlərdən illər boyu yığdıqlarının öcünü birdən alacaqdı. Xaqan qarşıdakı döyüş səfərinə qızğınca hazırlaşarkən əmilərinin Altaydan, Kadırğandan Sakit okeanadək nə qədər türk ulusları varsa toparlayıb Oğuzun üstünə yürüməsinin sorağını aldı. İrəli atılmaq istərkən arxadan vurulmuşdu.

Oğuz xan onları yurda buraxmamaq üçün Çu çayının solunda qalan boş çöllərdən, Balxaş gölünün güneyindən ötüb günlərlə günçıxana doğru getdi. Altay dağları ətəklərində ordalandı, az sonra əmiləri ilə qarşılaşdı. İki gün sürən qanlı döyüşdə hər iki qoşundan çox ərənlər qırıldı. Sonda Oğuz xanın gözlənilməz yan saldırıları əmilərinin qisas almaq istəklərini puça çıxartdı. Böyük əmisi öldürüldü. Yerdə qalanlar Kür xanın başçılığıyla Quzey-Doğu bozkırlarına, Tuğra sızrasına çəkildilər. Kür xan burda da əllərini qısıb

oturmadı. Böyük qardaşlarının qanını almaq, qudurğan qardaşı oğlunun burnunu ovmaq yanğısı Kür xanın varlığını sarmışdı, bundan ötrü kimə desən ağız açmağa, kidən desən yardım istəməyə hazırdı. Ancaq axtarmağa ehtiyac qalmamışdı.Onsuz da Çin elçiləri özləri imperatorun gizli məktubunu ona çatdırmışdılar. Məktubda İmperator, güya, ürəyiyanalıqla köhnə dostu Qara xanın taleyinə acıyır, qohumlar arasındakı düşmənçiliyin dərinləşməsini istəmədiyini bildirirdi. Ancaq söz yox ki, məktubun əsas məqsədi ayrıydı. İmperator söz arası Oğuz xaqanın gəncliyidən, bunun qonşularla münasibətləri poza biləcəyindən ehtiyatlandığını bildirir və ustalıqla ona da işarə edirdi ki, güya, ölkələrin mənfeyi üçün Kür xana hər cür yardım eləməyə hazırdır. Əslində, Çin imperatorunun gözündə xaqanlıq haqqı ona çatır... Məktub beləcə araqatan bir havayla doluydu və bu sözlər Kür xanı daha da qızışdırırdı. “Qana qan” deyərək, - irəli atıldığı hər döyüşdə itirdiyi yaxınların, daddığı məğlubiyyətin acısı onun intiqam və qəzəb yanğısını alovlandırır, özü öz içində qovrulurdu. Bu çılğınlıqla da o, quzey tayfalarından topladığı döyüşçülərlə gənc xaqanının üstünə daha bir yürüş etdi. Oğuz xan bu dəfə onu qabaqladı. Kür xanın onu harda axtaracağını bilirdi, ancaq həmin yerdən tərpənib sezdirmədən Qaraqoruma adladı. Qumlu çölün başlanqıcında gözlənilmədən Kür xanın qabağını kəsdi. Daha bir qanlı qardaş qırğını oldu. Qohum-qardaş dur demədən bir-birini oxladılar, qarğuladılar, qılıncla böldülər, al qanları ilə boz çölləri qızartdılar. Kür xan bu dəfə də yenilərək Gündoğana qaçdı. Bundan sonra Oğuz xan Qu-

zeydə yaşayan tatarların başçısı Altun xanla üzləşdi, yeniləcəyinin qaçılmaz olduğunu görən Altun xan tədbirli tərpəndi, elçi göndərib, "onsuz da bir-birimizi əldən salmışıq, qoy Böyük xaqan ümumi düşmənimizlə savaşa hazırlaşsın, biz ona düşmən deyilik, söylədiyi şərtlər içində ona yardım etməyə hazırıq" sözləriylə Oğuz xana itaət etməyə hazır olduğunu bildirdi, görüşüb, anlaşdılar.

Gənc hökümdar gücünü toparlamaq üçün yenidən Günbatana doğru çəkildi. Bütün qışı Balxaş yörəsində, qalın qarla örtülmüş dağların dalda, yel tutmayan, əsl qışlaq, düşərgə yeri dərələrində keçirtdi. Qara qırğızların xırda basqınlarına dözə-dözə Çin akınına hazırlaşdı.

## ÇİN YÜRÜŞÜ

Yeniyetməlik yaşlarından bu yolu çox keçmiş, Çinin ilin yeddi ayı su altında qalan, adamların qarışqa kimi qaynadığı, nəmli, könülsıxan iç oymaqlarınadək gedib qayıtmışdı. Ancaq indi başqa yolçuluqdu. İç savaşlardan, atasıyla, qan qohumlarıyla qanlı döyüşlərdən sonra ilk dəfə belə güclü yağıyla üzləşəcəkdi. Bu, Oğuzun, eləcə də xaqanlığının yaşayıb-yaşamayacağını göstərəcək bir yürüşdü. Bir yandan da Tanrı daşı başından çıxmırdı. Ara-sıra babasının dalınca da deyinirdi: "Başın bütlərə qarışdı, elin ən böyük tanqahını unutdun. Ulusun gününü də adınca qaraltdın, baba!"

Bir ilxı at, bir qaytaban[137] dəvə getsə, Oğuzu belə yandırmazdı. Daş qaytarılmasa, yurd dağılacaq... Bunu düşündükcə öfkələnirdi.

Yaz gəldi, yerlər-sular oyandı, yollar açıldı. Oğuz göylərdən səs gözlədi. Ayın bütövləşib dünyanı südlə doldurduğu gecə, günün ilk işığı dağların qarlı başını döyəndə Oğuzun türlü boylardan, soylardan dərilib toplanmış ordusu güneyə axdı. Bir aylıq üzüntülü yolu dözümlə, qarınlarına daş bağlayaraq[138] yürüdülər, sonda

[137] Qaytaban — dəvə sürüsü

[138] Qarınlarına daş bağlamaq — aclığa-susuzluğa dözmək

çinlilirən ilk gözətçi tikililəri göründü. Oğuz xan orduya bir həftəlik dinclik verdi. Bu arada ordunun öncül çəriləri, qulavuzlar dörd yanı aradılar, qarşıdakı yolları bələdləyib gəldilər. Gözətçi tikililərinin hərəsi bir qalaça olsa da Oğuzun yaxınlaşdığını eşidincə boşaldılmışdı. Beləcə Oğuz xan Çindən girib Maçindən çıxdı. Böyük dəniz, Dalay dənizi, Gündoğan dəniz deyilən Sakit okeanın yaxınlığından dayandı. Arxadan çaparlar gəldi. Kür xan yenidən toparlanmışdı, Sığnağa girib, Oğuz dönməzdən öncə saraya yiyələnərək, özünün xaqanlıq bildirisini yaymaq[139] istəyir. Oğuz xan hər biri özünü özgür sayan, biri-birini sevməyən, ancaq quzeydən gələn türk hücumlarına qarşı tezcə birləşən Çin oymaqlarının baş kəndlərində Tanrı elçisi kimi qarşılandı. Ordunun görmədiyi əliaçıqlıqla ağırlandı. Üzünə güldülər, di gəl, Yağmur daşından soraq çıxmadı.

Gündoğan səfərinin sonunda Aytac xatun Oğuz xana ilk oğul bağışladı. Adını Gün qoydular. Xaqanla xatun, ana-baba olaraq, onu ayrı adla da çağırırdılar, ev içində başqa adı da vardı, ancaq Gün adında türk əsilzadə soylarının göylə və yaranışla bağlı düşüncələrindən gələn gizli bir məna da vardı, bir yandan da bu ad uşağın Gündoğanda doğulduğunu andıracaqdı. İlk oğlunun adını Oğuz xan özü vermişdi. Bu adı da uyğusunda görmüşdü. Ağ geyimli bir qoca gülə-gülə "altı oğlun olacaq, onlara göy adları qoyacaqsan, Gök Tanrının istəyi, yarlığı belədir!" söyləmişdi. Oğuz xan yuxuya inanmışdı, adqoymaya göy hakimindən-Gündən başlamışdı.

---

[139] Xaqanlıq bildirisini yaymaq — özünü xaqan elan etmək

Oğlunun doğulmasıyla onsuz da çox sevdiyi, bağlı olduğu, uzaq, ağır yürüşlərdə də özündən ayırmadığı, usuna-sözünə çox güvəndiyi xatun Oğuz xana daha da doğmalaşmışdı. O, Aytaca da Tanrının ona sevgisi, ərməğanı kimi baxırdı. Ərlərin, alpların yetə bilməyəcəyi bir dözüm, güc, ərənlik vardı xatunda, üstəlik xaqanın ən içkin, sınanmış gənəşçisi də oydu. İllər boyu, yollar uzunu qarşıya çıxan yüzlərlə sorunu, düyünü çözməkdə Oğuza ondan çox yardım edən olmayacaqdı. Xaqanın buğra kimi, yaz selləri kimi kükrəyib, hər şeyi ayaq altına atmaq istədiyi çağlarda da Aytac xatun tövrünü dəyişməz, uymazdı, üzünün dolmuş ayın işığına oxşayan çəkici, bütün ağrı-acıları unutduran işığı azalmazdı.

Qan qohumlarının düşmən olması, eldən qopmaları xatunu üzürdü, savaşlarda onların ard-arda yenilib, vurulub, torpaqlara qarışmasına yanırdı, ancaq o da Oğuz xaqan kimi bunun qaçılmaz olduğuna, Tanrı yarlığını, eli qorumağın ayrı yolunun qalmadığına inanır, xaqanı içdən boğan ağrıları azaltmağa çalışırdı. Görünür Tanrı elçisini qorumaq üçün onun seçilməsi də göylərə bağlı bir işdi, bunu duyurdu, ərinə, elin başçısına, böyüyünə ömür-gün yoldaşı olmanun qüruruyla yanaşı, bu yolla Tanrının buyruğunu yerinə yetirmənin də sevincini yaşayırdı və ömrünün sonunadək bu duyğu içindən çəkilmədi...

Günün həyata gəlməsiylə yer üzünün yeni günlərinin başlandığına inanırdı. Oğul doğmaq - Oğuzun soyunu yenidən göyərtmək, xaqana davamçı gətirmək deməkdi. Ana cocuğunu bəslər kimi yox, elin yolunu qoruyan kimi böyüdürdü Günü...

Nəvəsinin doğuluşu Orxanı da qanadlandırmışdı. Axının geri dönməsini istəmirdi. Ona bağlı olan başqa atlıbaşıları da "aylarla yol keçib sonda Böyük dənizə varmamaq suçumuz olar, xaqanım" deyə irəliləmək istəyirdilər. Oğuz xan kəsə kəsdi:

- Qarşıdan qorxumuz yoxdur. Bizi eşidiblər. Elçilərimiz getsə, "sizə itaət edir, sizinlə el oluruq" sözünü alsalar yetərlidir. Başqa söz də bəkləmirəm. Çinə gücümüzü göstərdik. Yurdumuzda arxayın otura bilərik. Dönmək gərək!

Qardaşı oğlunun uzun sürən bu ilk yürüşündən belə arxayın danışması, hər şeyi bitmiş sanması Orxanı qorxudurdu.

- Xaqanım, Çin hələ basılmış sayılmaz, bizə soraqlar gəlir, toparlanıb qarşımızı kəsəcəklər. Bunların mayası çürükdür. Saxta gülüşlərlə başımızın altına yastıq qoymalarına uymayalım.

Doğrudan da, Oğuz xanı ölkələrinin içinə buraxıb, hər yerdə önünə gülərüzlə çıxaraq boyun əyən Çin oymaq başçıları bu özünəgüvənən, ərdil[140] türk xaqanını elə ərgənliyində, xaqanlığının başlanqıcında boğub, türklərin qorxusundan biryolluq sıyrılmaq, çolü büküb əllərinə almaq istəyirdilər. İndi bunun çağı yetişmiş, ov öz ayağıyla gəlib tələyə düşmüşdü. Çinlilər birləşmiş orduyla İpək yolunun bir qanadının Tanquta ayrıldığı yerdə, dar dərədə Oğuz xanın yolunu kəsdilər. Savaşın sonunu gözləmədən uğurlarını qutlayırdılar. On minlərlə türk, başda xaqanları, ovuclarının içindəydi. Göydən öydükləri Bir Olan Tanrıları da gəlsə onları burdan çıxara bilməzdi.

---

[140] Ərdil — cəsur

Oğuz xan aldadıldıqlarını görüncə ordu başçılarını gənəşməyə yığdı. Söylədi:

- Bu topraq külübələrdə[141] donuzlarıyla, toyuqlarıyla birgə yaşayan Çin kişiləri Tanrının gözü açılandan bizə yağı kəsilmişlər. Toprağın verimlisi, altunun sarısı, gümüşün ağı, ipəyin yumşağı, darının əkimli olanı... bunlardadır. Bizləri çöllərə sıxışdırıb, orda, qaba topraqlarımızda yaşamamıza da dözmürlər. Bunları bizim azad düşüncəmizlə dözümümüz, tükənməz gücümüz qorxudur. Yaranışdan elimizə qarışıqlır salıb, düzənimizi pozan bunlar olub. Tanrının yardımıyla gücümüzü göstərməliyik. Sözümün **tükətini**[142] eşitdiniz. İndi siz deyin!

Bəyləri dinlədi və bir daha söylədi:

- Bu yerləri uyğur atlıları daha iyi tanıyır. Onlar öndə getsin. Qalan gücümüz gizlənəcək. Uyğur atlılarını görən çinlilər gücümüzün azlığından qızışıb onları izləyəcək, onda uyğur okçuları göstərər bacarıqlarını.

Qoşunu geriyə, dərənin çıxışına çəkmək, sağ-sol yüksəkliklərə yardımçı oxatanlar göndərmək üçün Oğuz xana gün qazanmaq gərəkirdı. Bunun üçün Çin ordusunun qarşısına üç bahadır göndərdi: “Təkbətək döyüşü kim udsa, o yenmiş sayılacaq. Əsgərlərimizi qırdırmayaq...” Təklifi beləydi.

Çinlilər uzun saçları çiyinlərində oynayan, çevik çöl atlarının üstündə hərəsi bir divə oxşayan ərənləri görəndə, altmış tutam göndərilərinə, altun işləməli yaylarına, hər biri adam başı boyda gürzlərinə baxanda təkbətək döyüşdən çəkinib:

---

[141] Külübə — tikili, kümə, ev

[142] Tükət — son, nəticə

- Çini üç kişi yağmalamadı. Ordunuz yağmaladı. Hər kəsin öz suç payı var, qarşılığını alacaq, - dedilər.

Bu kərə Oğuz elçilərinə başqa bir buyruq verdi:

- Varıb, yağıya bizim savaş üsullarımızı anladın, biz qan tökmək istəmirik, döyüşü yarışla əvəzləyə bilərik. Savaşdan öncə at, dəvə yarışları keçirmək, alpların gücünü sınamaq ölkələrimizin əski törələrindəndir, istərlərsə belə başlayaq...

Çinlilər Oğuz elçilərinin bu sözlərini də **görgüsüz**[143], istehzayla qarşıladılar:

- Atlarımızın yüyrəkliyini, alplarımızın gücünü savaşda görəcəksiniz...

Elçilər döndü. Savaş qaçılmazdı. Ancaq bu danışıqlar Oğuza ordusunu yerləşdirmək üçün yetərliydi. Bundan sonra uyğur atlıları irəli yürüdü, Çin qoşununun qarşısında at oynadıb, meydan suladılar, savaş başlandı.

Çin xaqanı qah-qahla güldü:

- Bununlamı qorxudur bizi, xaqan?

Oğuz xanın atlılarının ürəyində qoyun sürüsünə girən qurd inamı olduğundan, qarşılaşdıqlarının azlığı-çoxluğu onları düşündürməzdi. Ölüm qorxusu olmadığından savaşa toya gedən kimi gedirdilər.Vuruş onların həyat tərziydi. Buna görə də uyğur atlıları qasırğa kimi təpildilər Çin ordusuna. Bir ucdan girib başqa ucdan çıxdılar. Bir- iki kərə də beləcə darasalar sayca özlərindən qat-qat çox olan Çin atlılarını sındırıb atacaqdılar, ancaq Oğuz xanın tapşırığı ayrıydı, buna görə də az sonra qorxubmuşcasına üz çevirib

---

143 Görgüsüz — qılıqsız, əhəmiyyət vermədən

qaçdılar. Sanki bir axındı dərənin dərinliyinə çəkilən. Çin atlıları ağırdı. Yüngül geyimli uyğur atlılarının yanında gülməli görünürdülər. Onlara çata bilmirdilər. Bunu görəndə uyğurlar atları yavaşıtdılar. Çinlilər yaxınlaşanda elə atlarını çapa-çapa qanrılıb oxu yağmur kimi yağdırdılar. Çin atlıları üçün bu bir göstərməydi. Öz oxları yüz- yüz əlli addımdan uzağa çatmazdı. Amma indi üç dəfə uzaqdan atılan uyğur oxları boğazlarını deşir, sinələrinə sancılır, atlarının gözünü çıxarır, ayaqlarını bir-birinə tikirdi. Çin atlıları türklərin dayanacağını, onlarla üz-üzə döyüşəcəklərini, qılınc, süngü savaşı gözləyirdilər. Belə sürətli at yürüşündə geriyə ox atmaq yuxularına da girməzdi. Bu qovhaqovda nələr baş verdiyini anlayanadək budaqdan silkələnən çürük meyvə kimi tökülür, töküldükcə seyrəlirdilər. Dərənin ən dar yerində ox yağışının təkcə öndən deyil, sağdan, soldan da yağdığını görəndə tələyə düşdüklərini anladılar. Vurnuxa-vurnuxa dolanıb, tək-tək vurularaq torpağa düşürdülər.

Sapa minib sürməni gözdən çalan[144] Çin xaqanı arxayındı. Türk qoşununun gücü atlılardadır. Onlar qaçdısa, deməli, Oğuz xanın gücü tükənib.

Öncədən düşündüklərinə görə artıq Çin süvarisi türk ordusunu dərədə yenib tükətməli, əsənliklə[145] geri dönməliydi. Atlı bölüklərin yubandığını görən Çin imperatoru təpədən-dırnağacan silahlanmış piyada qoşununu onların dalınca dərəyə soxdu. Qarşılarına ilk çıxan sahibsiz at bölüklərini görəndə şaşırdılar. Sonra dərə boyu səpələnmiş atlıların arasında düzən-

[144] Burada hiyləgər anlamında
[145] Əsənlik — salamatlıq

ləri pozuldu. Bu dəmdə sağdan, soldan yağan ox yağmurunun altında özləri də ərimәyə başladılar.

Savaş sonunda Çin imperatoru başındakı mühafizə dəstəsiylə birlikdə ələ keçirildi. Geri qayıtmağa, sağa, sola çıxmağa yol qalmamışdı, öz qurduğu tələyə, arxayınçılıqdan özü düşmüşdü. Oğuz xan imperatoru atdan enmədən, ancaq ehtiramla, döyüşün nəticəsini üzə vurmadan, sanki qeyri-adi heç nə baş verməyibmiş kimi, təmkinli, qürurlu bir tövrlə qarşıladı. Quraqlıqla, Çinin gəzib görmədiyi bölgələriylə ilgiləndi, sözü dolandırıb Yağmur daşının üstünə gətirdi, savaş istəmədiyini, yalnız Çin tərəfindən oğurlandığına əmin olduğu daşı axtardığını bildirdi. Onun bütün sorğu-suallarına baxmayaraq imperatordan Yağmur daşı barədə bir şey öyrənmək olmadı. Daşın Çinə gətiriləcəyini mümkün bir iş sayan imperator, adi oğruların məsuliyyətini daşımadığını, sarayın və özünün bu işdən xəbərsiz olduğunu bildirdi. Daşın oğurlanmasında qəsd də ola bilərdi. Bəlkə də iki qonşunun arasını pozmaq istəyənlərin barmağı vardı bu oğurluqda. Daşın imperatora çatmadığına inandı Oğuz xan. Ancaq imperatorun daşı ondan az olmayan bir maraqla gözlədiyini və ya axtarmağa hazır olduğunu da duydu. İmperator hörmətli xaqanın razılığı və lütfüylə bağışlanıb öz ölkəsinə qayıda biləcəyi halda, daşı axtartdıracağını boynuna çəkdi, xaqanın göndərəcəyi adamların ölkəni gəzib-dolanmasına da yardım edəcəyinə söz verdi. Bir yandan da Oğuz xan ona məğlub olmuş, qarşısında boynu bükük dayanan birisi varkən başqasının Çin taxtına yiyələnməsini istəmirdi. Bütün bunları düşünüb imperatorla bağlaşmanın şərtlərini mü-

əyyənləşdirərək onu azad edib geri göndərdi. Çin Oğuz xana ildə otuz min ipək qumaş, altmış min altun, otuz min kisə pirinç və darı verəcəkdi.

* * *

Çin sərhədindən uzaqlaşanda bir neçə atlıyla Tülü özünü arxadan orduya çatdırdı. Alıb xaqanın qarşısına gətirdilər. Oğuz onu babasının yaşa dolmuş gənəşçisi, ayğuçusu Uluqturklə birgə dinlədi. Tülü gözündən yaş süzülə-süzülə dedi:

- Xaqanım! Yalvarıram, mənə inan! Qadınım “yurdum üçün darıxdım” deyibən apardı məni. Ancaq Yağmur daşının çalınmasında onun da əli olduğunu biləndə ayıldım. Eşitdiyimə görə daşı Çinin quzeyində, dağlardakı bir tapınaqda gizlədiblər. İzinə düşə bilmədim. İnanmasanız, vurun başımı!

Oğuz onu öldürmədi, boş buraxdı. Gərəkirsə, Çinə göndərəcəkdi. Eyni zamanda Tülünü dinlədikcə birdən-birə dirçəldi. Qam Atadan gələn məktubu oxuduqdan sonra isə ovqatı birdən-birə tamamilə dəyişildi. Uluqtürk bunun səbəbini soruşanda, xaqan:

- Mən Tanrı daşını buldum, - dedi.

Qam Atadan gələn xəbər sanki onu uyğudan oyaltmışdı. Qam ata Ulduzçu Ərqut babayla yolları qapatdığına, oğruların qoşulduqlarından şübhələndiyi karvanın Çinə çatmadığına, yolu azıb qum dənizində boğulub qaldığına inanırdı. Bunun doğru olub-olmadığı gec-tez bilinəcəkdi. İndilikdə Oğuz xan Qam Atadan gələn xəbərlə Çin imperatorunun sözünün tuş gəldiyini əsas götürmüş, qərarını buna uyğun çıxarmışdı.

Ulutürk sordu:

- Nə yolla buldun?

- Mənim inancım Tanrıya bağlıdır, daşa yox! El içində Göy Tanrıya tapınanlar gündən-günə artır, bizə inananlar çoxalır. Bu gün Tanrı daşının əlimizdə olub-olmadığı önəmli deyil. Çinlilər daşı ələ keçirib-keçi-mədiklərini gizli tutacaqlar. Biz "bulmadıq" desək, elə öz içimizdən bəylərin neçəsi yağı kimi sevinəcək, bizi gücdən düşmüş sayacaq, üstümüzə ayaqlananlar da olacaq. "Qutsal daş məndədir" deyib bənzərini yara-daq!.. Ulusa, qonşulara, bəylərə duydurmadan.

Ulutürk düşüncədəydi. Xaqanın bilgisi, bu çıx-mazdan yol bulması onu sevindirmişdi:

- Anladım! Doğru olanı buldun! O daşın gücü səndədir. Tanrının elçisi sənsən! Yağmur daşı da yal-nız sənin əlində canlanır. Onu bulan başqası "gücləri-ni aldım" deyə mutlu bir uyğuya dalacaq, gücdən dü-şəcək. Qoy bu daşın bənzəri çox olsun. Daşa ilgi gös-tərən hər kəsə onu oğurlatdırarıq... Bundan sonra hər kəs daşın onda olduğunu sanacaq, ancaq kimsə bunu boynuna almayacaq. Daş çəkişmələri sezilmədən ara-dan qalxacaq, - söylədi və güldü.

İşin qalanı Ulutürkün boynundaydı. İnandığı bir daşyonan tapdı, görüşdü, anlaşdılar.

Çindən daş istəyi bir daha dilə gəlmədi. Ancaq gizli axtarış dayandırılmadı.

Xaqan geri dönərkən Talas, Saylam bəylərinin, "Oğuz Çindən qayda bilməyəcək!" deyərək itaət gös-tərmədiklərini, dikbaşlıq etdiklrini eşitdi.

"Oğuz xan inancımıza əl atdı. Bizi yolsuz qoy-du. Bütlərimizə sayğı göstərmədi. Atalarımızın törə-

sinə üstdən baxdı. Bizləri kiçiltdi... Tör başı, xaqanlıq üçün babasından keçən sabah bizləri də tanımayacaq. Öncədən ayırd edəlim” deyə ona qarşı çıxmışdılar.

Bəylərin baş qaldırması Ortaca dönüb İnci suyu boyunca əkin-biçini genişləndirmək, yeni kəndlər saldırmaq istəyən xaqanın yönünü dəyişdi. Talasla Saylamın üzərinə yürüdü. Dikbaş bəyləri asanlıqla aradan götürdü. Vergi yığmaq üçün öz basqaqını[146] qoyub qayıtdı.

Uğurlu Çin axını xaqanın adını yer üzünə yaymışdı. Günbatan ölkələrin elçiləri onun savaşdan dönüb düşərgələnməsini gözləyirdilər. Yanlarında türk, çin, soqd dillərini bilən dilmancları da vardı. Elçiləri türk törəsincə odun içindən keçirib xaqanın yanına buraxdılar. Onların öz ölkələrinin başçılarından gətirdikləri bitiklərin aşağı-yuxarı hər biri İpək yoluyla ilgiliydi, türk-çin savaşlarının bu yolu qapadacağından ehtiyat edirdilər. Uzaqda-yaxında yaşamasından asılı olmadan, hamının gözü bu yoldaydı. Sonra elçilər günbatanda ellər-uluslar arasındakı durumdan, yeni başçılardan, yeni kəndlərdən danışdılar. Biri-birisinin torpaqlarına girməmək, törələrə sayqı, yaxınlıq, birgə iş diləyi dilə gətirirdi. Onların ölkələrini hədələyən yağılardan qorunmaqda Oğuz xandan yardım istəyənlər də vardı. Xaqan bütün bu elçi dil bulamalarının arxasında nə dayandığını bilirdi. Dolaşıq, düyünlü danışıqları sevmirdi. Bu yerdə elçilərə göstərilməli olan xoşgörünü, uluslararası sözləşmələri unutdu və bərkdən:

---

[146] Basqaq basqal — darğa, vergiyığan, nümayəndə

- Mənə Asuru, Liviyanı, Misiri tanıtmağa qalxmayın. Onları da yetərincə tanıyırıq, çağında oraya da gələcəyik...

## OĞUZ XAN TÖRƏSİ

Çin yürüşünün uğuruna görülməmiş bir şənlik oldu. Sonra Oğuz xan Təktanrıçılığın eli birləşdirəcəyindən danışıb, ağır törələrini verdi və belə söylədi:

- Budunuma, ulusuma, elim-günümə!

Mən Oğuz xan, Bir olan, Uca Tanrının qutuyam!

Onun oğlu, sözçüsü və savçısıyam!

Onun istəyilə, ondan gəldim!

Elim-günüm, soyum da göydən endi. Altun işıqdan doğdu. Biz Tanrı işığıyıq! Göy oğluyuq! Tinimiz, düşüncəmiz, işimiz - hər şey göylərin işığına bağlıdır. Bu işığı yer üzünə yaymaq da bizə düşdü!

Biz Tanrı sözünün əkinçiləriyik! Onun istəklərini daşıyırıq. Bundan yana Tanrı bizə qanad vermiş... Us və güc vermiş! Mən Tanrının yerdəki kölgəsiyəm və onun söyuma bağışladığı ulugun, usun və gücün qoruyucusuyam!

Məni tutmayan Tanrını da tutmur, ona qarşı gedir!

Göy Tanrı mənim ulusumun, soyumun üstündə sonsuzadək var olacaq. Onun düzəni pozulmadıqca, Tanrı gözü, Tanrı əli üstümüzdə olacaq.

Elimizin sonsuzadək yaşaması, budunumuzun yer üzünün tək, dəyişilməz böyüyü olması Tanrıya sonsuz sevgimizi, ona uymamızı istər.

Eşidin, bilin!

Mən uca Tanrının qılıncıyam! Sevməyi bacardığım kimi, kəsməyi də bacarıram!

Ağac kökdən su içər, el düzəndən.

Düzənsiz el pozular, ulus yolunu itirər.

Tanrıdan gələn qutu qorumaq hər kişiyə düşür.

Türk içində böyük-kiçik, yuxarı-aşağı hər kəs birdir. Tanrının yaratdıqları bir gözlə görünür.

Tanrı məni tör başına gətirdi, elim-ulusum yolunda yorulmadan, bunalmadan, əyilmədən, mənim-sənin, yavuq-uzaq demədən, düzlüklə çalışmaqdan yana...

Eldə hər kəsin kişisəl azadlığı xaqanın qoruması altındadır. Varlıyla yoxsul ayrılığı yoxdur! Bir atı olanla bir ilxısı olanın, bir qoyunu olanla bir sürüsü olanın törə qarşısında yeri birdir.

Hər kişi elindir, el hər kişinin!

Hər kəsin acısı da, **sucığı**[147] da elliklə bölüşdürülür.

Ulusumuzun gucu Göy Tanrı inancındadır. Bu inanc ellə ulusu, xaqanlıqla çobanlığı bir görür. Kimsə başqasına uymaz, kimsənin sözünə əyilməz, bir insanı başqa insandan üstün tutmaz, yer üzünü də göy üzü təkin bütöv görər. Bir el - bir inanc!..

Elimizi ucaldan düzlük törəsindən yaxın-uzaq, oxşayan-oxşamayan bütün uluslara pay düşür.

Yer üzünün tək başı Tanrıdır.

Türk elində səs bir ağızdan çıxar.

Babadan qalan, törəmizlə mənə çatan el buna görə Oğuzun ocağı, Oğuzun elidir. Bu el mənim uluğumdur[148]. Bu elə bağlanan hər kəs Oğuz adlanacaq. Mənim

---

[147] Suçıq — şirin

[148] Uluğ — burada qismət

bir kəsimim olacaq. Oğuz eli sonadək yer üzünün görkü olacaq. Hər bir Oğuz Tanrının əsgəri olacaq.

Bu gündən Oğuz elinin ağır və yüngül törələrini açıram.

Oğuz eli düzənini, birliyini törəylə qoruyacaq. Bütün işlərimiz törəyə bağlanacaq.

Törə inancla qardaşdır!

Törənin başında Tanrıya, yaranışa sevgi dayanır. Varlığımız sevgidən keçir.

Varlığımızı el birliyinə borcluyuq. O pozulsa, adımız-sanımız itər.

Yurdun varı onun ulusudur.

Törəni yaradan ulus bəngüdür, qutsaldır.

Atalarımızdan qalan, bu gündən Oğuz-türk elinin olacaq törə əlbirliyimiz üçün yaranıb.

Əl olmaq, el olmaq, elçi olmaq - yer üzünə barış gətirmək, böyük yaradanı sevindirməkdir. Oğuz elinin ulu və sonsuz yolu barışdır!

Eşidin, bilin!

Mən Ulu, məngü Tanrının istəyi ilə, onun gücüylə danışıram. Ancaq Tanrı elçisi olmaq, xaqan olmaq yanlış işimə, yaxşıya pis deməyimə haq qazandırmaz! Xaqan olaraq törəyə hər kəsdən artıq mən bağlıyam! Dışdan gələnə qılıncım, içdən gələnə törəm var!

Mən göylərin uca oğlu, Oğuz xaqan, elimin istəyi və törəsi dışında addım atmam!

Törəmizə görə xaqan olaraq el böyüklərini, gənəş yığınağını, buyuruqçularımı uca tutacaq, hər işimi ulusun seçiminə uyaracağam.

El, dövlət - babadır! Bütün törətdiklərini bir gözlə görməlidir.

Yurdlarımız Tanrının yaranışa, yaranışın Tanrıya ən yaxın olduğu yerlərdir.

Yurd üçün, insan üçün çalışan, Tanrı üçün çalışır.

Başqa ellərin bu yurdlara soxulduğu çağlar oldu. Bac da verdik. Ancaq dilimizi dəyişmədik, uzun saçlarımızı kəsdirmədik, yad geyimi geymədik, törələrimizi pozmadıq, atalarımızın tinindən dönmədik.

Gücümüz bundadır!

Atalarımızın adına um verəlim, bəylər!

Göydən enən altun işıq yerə toxunanda bir dağ yaratdı. Ona Qutlu dağ dedik.

Baba başına fırlanan kimi, onun başına döndük.

Onun ətəklərində çoxalıb yer üzünə saçıldıq.

Qutlu, Tanrısal dağlar var olduqca, biz də varıq!

Başqa cür olsa, Tanrı qut yüləkini[149], qut uluğunu məndən çəkər. Ərdəm, bilik, us, anlayış olmadan yerdə Tanrı qutu qalmaz. Elimiz-günümüz bu dörd ayaq üstündə böyüyəcək.

Bən ulusuma ağır, ulu törələr qazandırıb yürürlüyə qoydum.

Oğuz elimi, qanımı, yaşamımı böyləcə qandırıb düzən içində qorumaq istəyirəm.

Atalarımızın törələrini qorumaq öz adımızı və Tanrı adını uca tutmaqdır.

Biz istərik çaşqın insan ayılsın. Törə düz yolla yürüyübən böyüsün. İlxılarımız, sürülərimiz, qaytabanlarımız güdülsün. Boyların, obaların, uluq-turuğun qayğısı sovulsun.

İnsan törəsiz qalsa yazıq olar.

---

[149] Qut yüləkini — inayətini

Ağır törəyə görə hər boyun bir onqonu, tuğu olmalıdır.

Ağır törəyə görə atalarımızdan qalan bütün nəsnələr qorunur, öyrədilir.

El içində hər boyun ayrıca öz törəsi də ola bilər.

Ağır, baş törələrdən başqa elin doğru keçinməsi üzərinə Tanrıya yükünc, yemək, soylamaq, elçilik, evlənmə, bayram, bəylərə bağlanmaq, toy, qurultay, ordu, ov, ata baxma, akın, yağma, xaqan seçilməsi törələrini də qoydum!

Güc əldən gedərsə, törə ayaqsız qalar.

Elim, budunum! Eşit, bil!

Yaşamım at üstədir. Günüm boşuna getmədi. Dinclik bilmədim. Yazın kölgə, qışın ev görmədim. Qılınc çalıb yağıları sındırdım.

Elimdə çəkişmə olmasın, qovğa çıxmasın deyə, hər kəsin yerini göstərdim. Adlarını, damğalarını verdim ki, yollarını bilsinlər. Mən-sən dedi-qodusu olmasın. Ürəyimdən tüzünlük[150] azalmadı. Könlümü Tanrıya düydüm, umudumu ona bağladım.

Ordaya düzən verib onu gərili bir yaya çevirdim.

Mən sizi oğuzladım!

Bu bölgü bu, düzənlə Göy Tanrının altında yer üzü var olduqca, biz də var olacağıq.

Uca Tanrıya yüm verəlim, bəylər!

Bundan sonra Oğuz xan şöləndəkilərə yeni Tanrı deyimlərini sundu. Oğuz xan görək nə soyladı:

Törəsiz eldən Tanrı dönər.

Törəni bilsə kişi, yürüyəcək hər işi.

---

[150] Tüzünlük — mərhəmət

Törənin düzü aydınladar üzü.
Ər ortaya gələndə inamsıza inancın bildirər.
Ər sevinməsə, qılınc qından çıxmaz.
Ər elçin, eşşək külçün doğulur.
Yüksəkdən baxan alçağa tez enər.
Yigidim sağ olsun, çıxılmayan dağ olsun.

Xaqanın hər sözü anında dillərə və bitikçilərin yazılarına düşürdü.

* * *

Yazdan bir ay ötmüş, Kür xan yenə ordu toplayıb günçıxandan Ortağa cumdu. Oğuz xan gəlib yetişməsini bəkləmədən onu Alataunun günçıxanında durdurdu. Kür xanın usanmadan, bıkmadan, axan qanlara yanmadan, yenidən onun üstünə gəlməsi, bu qədər yolu əngəlsiz keçməsi Oğuzun içini gəmirirdi.

Öz soyundan törəmişlərlə sonuncu, ən qanlı savaş burda oldu. İgidlər döyüşə-döyüşə "Ulu Tanrı yolunda!" deyib vurur, kəsir, atdan endirir, ancaq yendiklərinə baxıban, öz yavuqlarını görəndə, gözlərinin yaşını tuta bilmirdilər.

O döyüşdə Kür xan da öldürüldü. Onun ordusunun tör-töküntüsü, oğlanları, yegənləri Günçıxana doğru çəkilsə də, Oğuz xan bu kəs onlardan uzaqlaşmadı. Arxalarınca getdi. Xaqanın onlara yetib axırıncı kişiyədək qırmadan əl çəkməyəcəyini görən qandaşları dayandılar, bilici ağsaqalları elçi göndərdilər ona.

Elçilər bağır basdılar. Oğuz xan onların ayağına getdi, tək-tək hər birinin durumunu sorub sağında-solunda oturtdu. Onların nəyə gəldiklərini, nə deyəcək-

lərini bilirdi. Ağsaqqallar öncə Oğuz xaqanın Çinə uğurlu yürüşünü qutladılar və dedilər:

- Biz də səndənik! Sənin kökündən və soyundanıq. Kəsilən qol çiyindəndir. Nədən bizi qırıb yox etmək istəyirsən?

Oğuz xan dönüb onur yerində oturdu, görüşlərdə onun yanında olan qaynatası Orxanı göstərərək:

- Mən baba yerində ağsaqqallarıma yağı deyildim, - dedi. - Baxın, qayınatam Göy Tanrıya inanıb, evini də inandırıb, onun birliyinə boyun əyib. Sizlər də Tanrıya tapınarsanız, saldırılara son qoyarsanız, savaş bitər. Tək olan, yerlərin-göylərin yaradıcısı olan Ulu Tanrıya könül verməyənlərə qurtuluş olmayacaq.

Oğuz belə deyəntək ağsaqqallar bir-birinə baxdılar, öz aralarında uzun-uzadı sözləşib gənəşdilər. Sonra göyə üz tutub Tək Tanrının birliyinə və böyüklüyünə yükünclər söylədilər.

Oğuz xan "Qaraqorumdan ötə bütün torpaqlarımız sizin, qandaşlarımın olsun!" deyə onlara ərmağanlar, pay-ürüş verib geri göndərdi. Yalnız bundan sonra günçıxandan əlini çəkdi. Oranın bir daha baş qaldırmayacağına inandı, geri dönərək ölkə içində babasından sonra ipə-sapa yatmayanları yerində oturduban eldə düzən yaratdı, yeni türüklər, yasalar[151] verib ulusun könlünü aldı.

Elçilər Oğuz xanın görüşünə gəldiklərində daha bir ilginc olay olmuşdu. Oğuzun birinci, ikinci qadınları Banuyla Tərçiçək başlarında qaravaşları, künləri[152] "Savaşdan, qandan, yürüşdən bıkdıq, öldürürsən öldür,

---

[151] Türük-yasa — qayda-qanun

[152] Kün — cariyə

saxlayırsan saxla" deyib Oğuz xana boyun əydiklərini bildirdilər. "Sənə inanmadıq, Tanrı nəslimizi kəsdi. Babası olan babasız, qardaşı olan qardaşsız, yurdu olan yurdsuz qaldı. Keç suçumuzdan, bizi el içinə burax! Yurdumuza dönək. Sənin qanadının altında keçinək. Ulu dağlarda, qutsal torpaqlarda bu barış üçün onlarla tapıq kəsmiş, saçılar saçmışıq[153]" - dedilər.

Orxan Oğuz xanın bozarıb dəmirə dönmüş üzünə baxanda qorxdu. Ancaq geri durmadı, qardaşı qızlarını ordaya buraxması, suçlarından keçməsi üçün o da yalvardı xaqana:

- Qardaşlarımdan qalan onlardır. Burax, gəlsinlər! Gözümüzün önündə yaşasınlar. Bundan ötə nə yapacaqlar sənə?!

Bu yandan da Aytac gözüyaşlı, xaqanın əllərindən tutub:

- Keç suçlarından, - dedi. - Olsun ki, bu qırğınlar da sona varar...

Oğuz onları qırmadı...

---

[153] Saçılar saçmaq — qurban paylamaq

## TAPINAQ QAYĞISI

Uslu Xoca Ata Ünürdən dağınıq düşüncələrlə qayıtmışdı. Qam Ata Oğuz xanla son görüşlərini anıb: "O, türkün yolunu dəyişəcək, səsimizi yer üzünə yayacaq... Göylərin mənə söylədiyi, uyğularımda gördüyüm budur. Elin, budunun qurtuluşu üçün bir olan Göy Tanrıya tapınıb, inancını dünyaya yayması gözlənilməz deyildi. Bu, onun üzündə yazılmışdı. Qutsal bitiklər də, Tanqut, çin baxıcıları, bilgili görümçülər[154] də Yer üzünü başdan başa öz bayrağının altına alacaq, insanın üzünü göyə çevirəcək bir türk xaqanının gələcəyini öncədən bildirirdilər" - demişdi. Ardınca onu da bildirmişdi ki, Göy Tanrının bölünməz olması onun yaratdığı yerin də Tanrıya bənzəməsini istər. Yeri tək bir el olaraq görmək arzusu burdan qaynaqlanır. Kiçik ulusların el olub, onlara bağlanmasının tanrısallığı, vacibliyi burdan gəlir. Oğuz xaqan inancı, tanrıçılığı yaradana sevgi üçün deyil, özünə sevgi üçün qullanır. İnanc qutsallığını itirib, tac-taxtın, xaqanlığın dustağına çevrilir. Bütün çağlarda belə olub. Yer üzünün bütün böyük

[154] Görümçülər — fala baxanlar

iliglәri, xaqanları özlәrini Yaradan, inanc yançıları kimi göstәrsәlәr dә, inancı öz yanlarına çәkәrәk, qutsallıqdan çıxarıb qılıncın, zorun, törün yardımçısına çeviriblәr. Qara camaatın inancıyla ona başçılıq edәnlәrin inancları da, yaşamları da ayrıdır. Bәylәr öz yaradanlarını da varlı, bayat olaraq görürdülәr. Bir tikә çörәyini zorla tapan әkinçinin, biçinçinin yaradanı da özü tәkin könlü toxdur. Onun Yaradanı böyük şölәnlәr, saysız tapıqlar istәmәz. Köylünün bir ovuc darı saçısı, qansız qurbanı da ona yetәrlidir. Ulu gün deyilәn sağınc - qiyamәt günü gәlәndә könlünün necәliyi bilinmәyәn Tanrının nә qәrar verәcәyi, insanlar arasında necә fәrq qoyacağı, onlardan hansını tamuğa[155], hansını uçmağa aparacağı kimsәyә bәlli deyil.

Qam Atanın bu sözü qarşısında Uslu Xoca demişdi: “Yer üzü yaranandan heç bir kişioğlu öz inancının daha doğru, yolunun daha düzgün olduğunu sübut edә bilmәmiş, başqalarından artıq, daha düzgün olduğunu göstәrmәk üçün bir qum dәnәsincә, bir tel qәdәr ip ucu vermәdir”.

Sonra Qam atanın Oğuz xanla birgә olmasının qaçılmaz olduğu söylәnmişdi: “Bu bir alın yazısıdırsa qarşısı alınamaz; bir elin dirçәlişi, dünyanın bütövlәşmәsi üçünsә “yox” deyilmәz. Birincindә Tanrıya, ikincindә elinә qarşı çıxırsan”. Qam Atanın sözünün kәsildiyini görәndә fikrini daha qәtiyyәtlә bildirmişdi: “Bunu anladığımdan Oğuz xaqanı dәstәklәmәkdәn başqa yol bulmuram”. Qam Ata da öz düşüncәsini gizlәmәmişdi: “Könlümdәki sızıklar, şübhәlәr qalır.

---

155 Tamuğ — cәhәnnәm

O, düşüncəmlə dilim arasında çəpər çəkir. Acı olanı budur. Bunca ikiləşməni istəməzdim".

Uslu Xocanın Qam Ataya güvənci sarsılmışdı. Ançaq bunu açıq demək, qamları, onlara bağlı olan görümçüləri, ulduzçuları, qumçuları, əl oxuyanları Oğuz xanın üstünə qaldırmaq istəmirdi. Ata Ünürün bir xaqanın yox, bütün yaradılmışların keçmişini qoruyan, gələcəyinə işıq tutan əvəzsiz bir saxlancı, ağuluğu var, açarı da Qam Atada. Təkcə onun aça, oxuya, dəyərləndirə biləcəyi yüzlərlə yazı, bitik qorunur orda. Qam Atayla üzülüşməklə bunlarla də üzülüşər, eli kor qoyarsan.

Ata Ünürü göz altında saxlamaqdan, qamların ipini möhkəm tutmaqdan başqa bir yol yoxdu. Qam Ata da öz sırasında Oğuz xanın ona inanmadığını bilsə, Ata Ünür itirilərdi. Düzdür, ora artıq tözlərə, onqonlara, çələblərə yalvarış yeri deyildi. Ancaq yerin-göyün gizlinlərinin açarı idi. Bunu Qam Ata da bilirdi və tözlərin dağılmasıyla, Ata Ünürün dəyərsizləşdiyi düşüncəsindən çox uzaqdı. Tapıqlar da yalnız uyuqlara, onqonlara kəsilmir. O dünyaya köçənlərin ruhlarına kəsilir. Buna görə də Ərkondakılar qayğısız yaşayır, dünyadan qopub ayrıldıqları yadlarına düşmür. Bu yol bağlanan gün elin işığı kəsilər, bilgi yolu bağlanar...

Ata mağara öncə bilgi tapınağıdır. Ora dağılsa ulus savaşdan, öz içindəki didişmələrdən baş açıb, böyüklərinin yazıtlarını oxuya bilməyəcək, keçmişi unudacaq. Qam Ata bunu görür, bu ağrını yaşayırdı.

Oğuz xan dedi:

- Törə dəyişilmir, tapığımızı böyük yaradanımıza, bir olan Tanrıya verəcəyik. Qurban verməyən ulus yoxdur. Ayağımız ünürdən kəsilməsə Qam Ata uzaqlaşmaz.

Uslu Xoca xaqanın sözüünü anladı. Bu boyda xəzinənin ulusun üzünə bağlı olması onu da üzürdü. Bu, qamların istəyincəydi. Elbəyləri, ulus böyükləri-ni, xaqanları özlərindən asılı saxlamaq istəyirdilər. Bildiklərini kimsə bilməməliydi...

Uslu Xoca yüz illər, min illər boyunca yığılmış bu bilgi tapınağının yurda, cocuklara açılmasını, onla-rın əski yazıtları öyrənərək oxuyub yazma bilmələri-ni, el içində açarıların artmasını istəyirdi.

Oğuz xan da xalqın verimli torpaqlarda yerləş-məsini, Çindəki kimi yazma-oxumanın hər kəsin ba-cardığı bir iş olmasını diləyirdi.

Döyüşə gedən ordu hər dəfə ən cəsur ərənləri yad torpaqlarda quylayıb qayıdır, qırıla-qırıla incəlir, incələ-incələ özünü itirir, kökündən uzaqlaşıb yadlaşır. Bütün yaramazlıqlar da burdan irəli gəlir. Ocağın ocağa, bo-yun boya, elin elə qarşı dayanması, hərəsi bir ad, bir ça-tı altına sığınan - kökdə isə hamısı eyni olan ulusların bir-birini qırıb tükətməsi yetər! Bu bir yad tələsidir!

Uslu Xoca çox şey bilirdi. El ağzında gəzən söz-lərdən başlamış Ata Ünürdə qamların üstünə örtük çəkib gizlətdikləri yazıtlara qədər, baş vurmadığı bir gizlin qalmamışdı. Çöllərin aydın görən gözü, uzaq eşidən qulağıydı.

Oğuz xandan soruşdu:

- Çində çoxmu itirdik?

- Yox! Can itkiçi azdı, - dedi xaqan. - Amma göz və duyğu itkisi oldu. Yüz illərcə bütün qonşularını qultək işlədib özlərinə uçmaq yeri yaratmışlar. Ve-rimli torpaqlara, gözəl yurdlara yiyələnmişlər. Birlə-şib, elləşib güclənmişlər.

- Ancaq sənin gördüyün yerlərin çoxu əski türk yurdlarıdır.

- Əskidə çox şey vardı, nə olsun? Bu gün hər yerdə tabqaçlardı, di gəl, döndülər, dəyişildilər, əriyib getdilər, köklərini unutdular, bitdi! Xalq bizdən, bəylik onlardan... Çinlidən daha qatı yol tutan da bizlərdəndi. Dönmələr... Yurddan qopunca yurdun yağısı olurlar.

Uslu Xoca dedi:

- Bilirsən Çin xaqanı necə çəkir bunları? Hərəsinə bir yalançı bəylik, xanlıq verir, yurd burda, onlarsa dışarıda... bayraq qaldırırlar. Qafalarında hərəsi bir türk eli qurur. Sonra onları "Gedin Tanrı verən yerlərinizə yiyələnin" deyə üitümüzə göndərirlər. Hərəsinin öz tuğu qalxanda türklüyün uca bayrağı ayaqlar altına düşür.

Oğuz xaqan dedi:

- Çinliləri qılıncla yenmək zor deyil. Bir kərə yendik. Bundan sonra da əzərik. Ancaq bizimlə döyüşməmək, əskərlərini, torpaqlarını qorumaq üçün mallarından keçir, yetərincə ipək, pambıq, arpa, pirinç, altun, gümüş verirlər. Bizdə insan dəyərsizdir, yolun daşı, göyün quşu kibi... Onlar ərlər üçün malından keçir, biz dünya malı üçün ərlərimizi itiririk. Ulusu bu ağrıdan qurtarmaq üçün bilgi verməliyik. Qonşularla işi bitirib içimizdə bu düzəni quracağam.

* * *

Oğuz xan Çin yürüşündən dönərkən "Cadu daşı bulundu" görüntüsü yaratsa da, onu aramaq üçün qonşuların dilini bilən ərənlərdən dördünü Çinin içinə gön-

dərmişdi. Əlləri yetən hər yeri arayıb umudları kəsilmiş, geri qayıtmışdılar. İllər uzunu yağış gözləyibən cadar-cadar olmuş Çin sızralarına bu daş sanki bir damla yağış kimi düşmüş və cadarlarda yoxa çıxmışdı.

Yağmur daşının Çinin güneyində gizlədilməsini eşidərkən "sözün doğruluğunu yoxlamağa yeni kişilər göndərəlim"dedi. Uslu Xocanın inanılan, xaqanlığa yaxın olan oğlu Qutluqa, gizlin tapşırığını verdi: "Yağmur daşı bizə göndərilən bir Tanrı sevgisıdır. Onu itirməklə Ulu yaradanı incitdik, üzü dönəcək bizdən. Onu tapıb gətirmək elimizə bir ordudan daha artıq yardım göstərməkdir". Bunu eşidən Uslu Xoca Oğuz xana dedi:

- İki oğlum var, ikisi də sənin kölgəndədir. Öl desən ölər, qal desən qalarlar.

Bu, Uslu Xocanın uğurlamasıydı. İkinci oğlu Ərdəm orduda yüzatlıbaşıydı.

Qutluq ərdəşləriylə yedi, içdi, sonra minatlıbaşı Ərgənin evinə vardı. Sevib-seçdiyi Elbilgəylə halallaşdı:

- Uzun bir yolumuz var. İki il gözlə. Gəlməz olsam, eldən birini seç, könül ver, get! - dedi.

Qızın göz yaşı saçıldı. Bıldır-bıldır ağlayıb-sıtqadı:

- Ağır xəbərin gəlincə, mənə ölüm gəlsin, bəkləyəcəyəm! - dedi.

* * *

Çin xaqanını yenməsi Oğuz xanın başını ucaltmışdı. Ancaq bu uğur onu şişirtmədi. Kadırğan ormanlarından[156], Altaylardan tutmuş İtil irmağına-

---

[156] Altayların güney doğusunda bir bölgə

dək babasıyla yürüşlərdə görüb-tanıdığı xalqın içdə aşsız, dışda donsuz, havadan, sudan, yağmurdan asılı olması, hər tərəfdən saysız basqılarla üzləşməsi onu üzürdü. Bu işin təkcə sözlə düzələcəyinə bel bağlamırdı. Savaşsız, qansız bitməyəcəkdi bu iş. Elim bir olsun, toxunulmaz olsun deyəndə bağrı od tuturdu. Ordasını, baş kəndini elin ortasına çəkmək istəyirdi. “Yer üzünün məmələri” deyilən iki irmaq ulusunu əmizdirəcəkdi. Baş kəndi üçün çoxdan bəri yer də bəlirləmişdi. İnci[157] irmağının sağ yaxasında, Aral dənizinin yaxınlığında Çində gördüyü kəndlərdən geri qalmayan yeni yurd salacaqdı. Qoy ulusu hara istəyir qanad açsın ancaq isti yuvasını unutmasın. Onsuz da Oğuzu atdan endirmək, savaşdan, yürüşdən qoparmaq olmazdı. Onu gücsüz görüncə anında başının üstünü alar, əlindəki geniş torpaqları paran-parça edərdilər. Aşağı-yuxarı hara baxırsan dişlər qıcanıb. At belində dinclik bilmədən yürüyən ulusunun yaranışın özü qədər görklü, sevgiylə dolu olduğunu görmək istəmirlər. Yer üzü bir savaş alanıdır. Ara vermədən vuruşmalı, qan tökməli, özünü qorumalısan. Yoxsa başqalarının yemi olacaqsan, səni əzəcəklər. İndi bax, Çinin əzilməsini görə-görə güneyin hindi ara vermədən dingildəyir, qarışqa sürüsü kimi axırlar onların üstünə, qarşısı alınmasa bura da qarışacaq. Öz elini güclü, bütöv görmək istəyirsənsə gərək bu ilanın da başı əzilsin. Sağını-solunu təmizlə ki, evində qorxusuz, könül xoşluğuyla otura biləsən.

---

[157] İnci — Sır-Dərya çayı

Yalnız xaqan olandan sonra Oğuz babasının illərcə ara verməyən yürüşlərinin səbəbini anlamışdı. Qorunmaq, üstəlik eli yedizdirib-içirtmək, atalarının yurdlarını bərədə yatmış ovçulara qapdırmamaq zor işdi. Uyğu bilmədən günbatandan gündoğana, quzeydən - güneyə yürüməlisən. Hind eli də qalabalıq, keçilməzdi. Dağlar, sıx ormanlar onları qoruyurdu. Qarşıda Tanqut tərəfdən keçilməmiş, bəlirlənməmiş bir yol vardı. Uca yaylalardan, dar dərələrdən keçib getmək üçün havaların isinməsini, göndərdiyi elçilərin də geri dönməsini gözlərkən Qurban ayı gəlib çatdı. Bu gələnəyin çox-çox əski çağlara, olsun kim, ilkin ocaqlara, böyük başlanğıca bağlı olduğunu bildiyindən törəni pozmadı. Ordusuyla Ata Ünürə getdi. Böyük qapıdan sonra başlanan sızra yenə gözəldi. Yenə dağ çayının, bulaqların başında alaçıqlar quruldu, qurbanlar kəsildi, sızranın bəkil bəyləri, qamlar sorağa axışdılar. Hər kəsin üzündə bir sorğu vardı.

Oğuz xaqan bunu anlayıb dedi:

- Bir olan Ulu Tanrı yardımçınız olsun, bəylər. Yaradanın varlığına yaradılan şahid! Tanrı minlərcə canlı yaratdı. Bizləri də o göndərdi! Yaqız yeri, mavi göyü, günü, ayı, gecələri, öglə ödləyi yaradan da Ərkli, Oğan[158], Bənqu Tanrıdır. Yaşadığımız sular, yerlər ulu Tanrının altındadırsa, onun adına bağlıdırsa bir parça yer çamurunun, bir çöl qaçarının ruhu bizə necə bayatlıq edə bilər? Bu yolu bizə başımızdan basmaq istəyənlər öyrətdilər. Törəlik kişilər buna uymaz. Baxın, bu, Tanrı sevgisiylə yapılırsa, niyə bütün

[158] Oğan — qadır

ulusa öyrədilmir. Hər bölüyümüzü  bir inanca bağlamaq istəyirlər. Bu, inanc işi deyil. Sularımıza-yerlərimizə yiyələnmək yoludur. Elədə, duşuncəmizlə ulusumuza inanıb, bir olan Tanrımıza güvənib öz içimizin işığında, özlük düşüncəmizlə yaşamalı, bu işığı, türk ruhunun böyüklüyünü yer üzünə yaymalıyıq. Bizim yolumuzdan başqa yolların yolsuzluq olduğunu, yaranışı ölümə apardığını hər kəs görüb bilməlidir. Onqonlara yağı deyilik, çünki onları da Göy Tanrının törənmişi sayırıq. Bunları deməsəm, Tanrıma baş qaldırmış olaram. Bu bir xaqanlıq istəyi deyildir. Mən elimizin törəsincə xaqanam. Xaqan olaraq hər birinizin yaşamını düşünürəm. Xaqan olaraq elin bayrağını yer üzünün hər yanında dalğalandırmalıyam, dalğalandıracağam da! Xaqan olaraq yer üzünə səpələnmiş boylarımızı, uluslarımızı topalayıb türk budunun arasındakı qırğınlara son qoymalıyam. Bu işi görəcəyəm! Yalançı qonşularımız qarşısında türklüyün böyüklüyünü göstərməliyəm, göstərəcəyəm də! Yoxsa, Tanrı yanına üzüqara gedərəm. Bilin bəylər, hələ ana qucağındaykən Tanrıdan elçilik-yalavaclıq tapşırığını almışam... Anam, babam, yavuqlarım, yüzlərlə yar-yoldaşım buna tanıqdır, şahiddir.

Türk yerləri-suları, elimiz-günümüz yalnız türk Tanrısıyla özünü tapacaq, özünə qovuşacaq. Tanrıtək yaradılmış türk insanı yalnız Tanrıya tapınanda üzü güləcək, bütöv olacaq. Biz Tanrının sivgisiylə, ilkin törədilmiş, gözəl insanlarıq. Tanrı bizi yer üzünün böyük budunu, bəyi olaraq yaratdı. Yer üzünün uluslarını elə çevirib dikəldən, bütün qonşulara düzən verənlər də bizdən olanlardır. Ərkli, görklü, baş-

ların başı, ucaların ucası-bir olan türk Tanrısıdır. Öydüyüm Uca Tanrıyla, uca elimə-günümə sevgimlə bir yol başladım. İlana ağu verən Çin imperatorunu ayağımıza saldıq. Başqa ellərə də gedəcəyik, yenə də Tanrı bizimlə olacaq. Törəmizi ayaqda tutmaq hər kəsə düşür. Nə etdimsə Ulu Tanrının istəyiylə etdim. Yonma ağac, çamur tözləri, onqonları sındırmamı anlayın! Elimi sındırmadım, sizi qırmadım, siz də məndən qırılmayın...

Qamlardan biri sordu:

- Bəs Ata Ünür nə olsun, bütlərlə birgə elimizin-günümüzün yaddaşını, ötüb keçənləri də dağıdaq, eləmi? Bəlkə ordakı bitiklər də, bəlgələr də ayaqlansın?

Oğuz xan dedi:

- Ata Ünur türkün beşiyi, keçmişi, gələcəyidir. Ona əl uzadan əlsiz qalacaq. Atalarımızın sözlərinin, izlərinin eldən gizli saxlanmasını istəmirəm! Hamı savaşçı deyil, hər kəs axına getmir. Bilimlə ilgilənən oğlanlarımız Çinə varır, bilik alandan sonra da dönmürlər. Mənə, xaqan uşaqlarına öyrədilənləri hər kəs öyrənməlidir. Eli bilikdən uzaq saxlayanlar onu təkcə çoban-çoluğ, dəmirçi, savaşçı görmək istəyənlərdir. Nə çağadək məzar daşlarımızı da, yazı-bitiklərimizi də bizdən qopub Çinə sığınan yad qafalı bitiçilərə[159] yazdıracağıq? Bəlkə söyürlər bizi orda? Bilirsinizmi? Çinin ilan-qurbağasının yanında Türkün qutsal yazısını da görün, öyrənin!

Qam Ata bir yandan Ata Ünürün qutsallığının bitəcəyindən, Ərkonun ayaq altında qalacağından

[159] Bitiçi — burada katib, yazar

qorxmuşdusa, bir yandan da bilginlərin[160] dəyərləndirilməsinə, çocuqların anlayışlı böyüyəcəyinə sevinirdi. Buna görə də xaqanın sözünü tutmaqdan, onun dediklərini eləməkdən başqa, yolu qalmamışdı.

Oğuz xanın düşüncələri ona yad deyildi. Gördüyü yuxular, oxuduğu yazılar, inancının bitəcəyini, yer üzündə Təktanrıçılığın yayılacağını deyirdi. İnsan hardan başlamışdısa ora da dönməliydi. Ancaq bütün bunların onun çağında olacağını gözləmirdi. Göylərin yerə elçi göndərməsi bilinən işdi. Kişi oğlunun tini dəyişmiş, yerin düzəni pozulmuşdu. Ancaq bu elçinin Oğuz olacağına inana bilmirdi. "Yazıya pozu yoxdur", - deyibən dinləyir, öfkələnməklə iş aşmayacağını anlayırdı.

Bilgili, törəlik kişi, ərgənlik yaşında olan xaqanın dürüstlüyünü, inamını görür, getdikcə ona daha çox bağlanır, öz yanılmalarının acısı azalır, Oğuzun yoluna ümidı artırdı.

Yeməklər yeyilib, ərənlərin ötkü, atqı, basqı yarışları başlayanda Qam Atayla Oğuz xan Mağaraya çəkildilər. İllər boyu ondan çox şeylər, çox yazıtlar öyrənmişdi. Gündoğan-günbatan arası elləri, çölləri, dağları gəzəgənlərdən[161] yaxşı tanıyırdı. Ölkələri, budunları, kəndlər arasındakı yolların uzunluğunu, ulduzlarla, ayla, günəşlə yerin bağlılıqlarını bilirdi, türlü[162] ellərin inanclarından, yaşamlarından bilgisi yetərincəydi. Ancaq Qam Atanın sonadək açılmadığını, Ata Ünürün bəzi gizlinlərini ondan uzaq tutduğunu da duyurdu, hər gələndə də, bu gizlini arayıb bulmağa çalışırdı.

---

[160] Bilgin — alim, oxumuş

[161] Gəzəgən — səyyah

[162] Türlü — çeşidli, müxtəlif

Günbatan yürüşündə yolların ən ağırını keçəcəkdilər. Könlu qanadlanırdı:

- Sən keçmişi-gələcəyi bilənsən, Qam Ata, - dedi. - Bunca karındaş kanından sonra savaş ruhları bizdən, budunumuzdan əl çəkəcəkmi? Qarşıdakı axınımızıdan nə bəkləyirsən? De mənə!

- Bu akından da uğurla dönəcəksən! Ancaq...

- Nə ancaq?

- Alın yazın sənə ayrı yol göstərir. Çin, hind son olmayacaq. İllər öncə babana da söyləmək istədim, sözümü duymayacağından qorxdum. Sən yolun başındasan. Ərdəmli, qorxmazsan. Ulduzlar böyük gələcəyindən yanadır. Sənə söyləyəcəyəm...

Oğuz xan gözlədiyi anın yetişdiyini duydu.

Qam Ata bu sözlərdən sonra Ünürün qaranlıq bucağında görünməz oldu. Orda daş yerindən oynadı. Dönüb Oğüz xanı da səslədi:

- Gəl, xaqanım, gəl də, bax! - dedi.

Açılan yarığdan içəri keçdilər. Öncə gördüyü otaqlardan daha böyükdü. Künclərdə iri dəmir sandıqlar qoyulmuş, sərilər[163] dəri, papirus, gil, saxsı lövhələrlə, yazıtlarla doluydu.

- "Yurdun yaddaşı" dediyim gizlin otaq, baş ağuluq budur, xaqanım! Bütlər yıxılsa, yenisi yapılar, inanclar da dəyişilər. Ancaq bu saxlanc itsə, yaradanın dili, yaradılışın kökü biryolluq unudular. Kişioğlunun keçdiyi yollar yaddan çıxar. Buna görə bura həm də "Tarixin yaddaşı" deyə bilərsən.

- Babama da bunlarımı göstərəcəkdin?

---

[163] Səri - rəf

- Baban ilgilənmədi. Yalnız çələbilərin ruhunun yaşadığı yer olaraq baxdı Ata Ünürə. Akınlardan, savaşlardan başı açılmadı. Bayatların, çələblərin, tenqrilərin, xeyirlə-şərin - bütün inancların kökünün burda olduğunu bilmədi. Daşla yağmur yağdırılmaz... Baban o daş uğrunda vuruşanda sənin Tanrıçılığın üçün vuruşduğunu bilmirdi. O, Yağmur daşını ruhların daşı sanırdı. Bir olan Gök Tanrıdan gəldiyini bilmirdi. Yağmur daşının üstünə vurulan Tanrı damğası burdadır.

Qam Ata sandıqdan nədən yapıldığı bilinməyən, yenicə cilalanmışcasına yanan, ovuc içinə sığışan bir damğa çıxartdı.

- Bax, burada Tanrı yazılıb, bu səkkiz oxlu araba təkərinə bənzər damğa ondan gəlib, onun simgəsidir. Bunu Ata Ünürdə çalışan qamlar çox əski çağlardan qorudular. Xaqanlar belə bundan soraq tuta bilmədilər. Suyun və qumların yeri örtdüyü, kişioğlunu qovub dünyaya səpələdiyi çağlardan çox-çox öncə də atalarımız tanrıçı olublar. Ancaq Tanrının türk budununa yapdıqlarına dözməyib ondan üz döndəriblər.

- Bizim dağları, qobuları su basdığını duymadım.

- Yox, biz bura sudan yox, Tanrıdan küsüb gəldik. Buranın çayına, dağına, ağacına, malına tapındıq. “Bir olan Tanrıdan intiqam alırıq”, - dedik.

- Nəydi Ulu Tanrıdan gileyiniz?

- Atalarımızın min illərcə qurduqlarını yıxıb dağıtmaq!.. Tanrının gizlinlərinə əl atırdılar. Quş kimi göydə uçur, iqlimləri dəyişir, yerləri-suları idarə edirdilər. Tanrı da qızdı buna. İndi onlardan nə isə qalmır. Tanrı bizləri unutqan yaradıb. Uzun yüzillər, minillər keçdi aradan.

Oğuz xan sanki yuxudan ayılmışdı. Bu yollar hardan keçib, harda dayanıb. Ulus nələri itirib, nələri qazanıb. Bu gizlinləri kim bilir? İtirilmiş açarları kim tapacaq, bu sandıqlardakı bitiklər əski çağlar uzanan ipucudursa, onu kim tutacaq, kim itirilmiş keçmişə, itirilmiş dünyaya yol arayacaq.

Qam Ata deyirdi:

- Çinlilər, tanqutlular buranı yalnız tapınaq bilirlər. Bitik saxlancı olduğunu duysalar, çoxdan saldırardılar. Ən əski quruculuqların, ilk yaranışın bizim adımızla bağlı olmasına dözə bilməzlər. Tanrının yerə göndərdiyi daşlar da yalnız bizim əlimizdə, qamların yüküncləriylə güclüdür. Önəmli olan göylərin dilinin, yazıtların qorunmasıdır. Sən xaqan olmaqla yanaşı, baban kimi həm də inanc başısan. Bunu bilməlisən.

- Bilmək azdır, həm də öyrənməliyəm.

- Buna bir ömür çatmaz, xaqanım! Yalnız bir böyüyümüzün yazdıqlarımızı oxusan yetərlidir. Orda hər şey var. Bir xaqana gərəkən hər şey. Yaranışdan bəri ulusumuzun keçdiyi bütün yolları yazıb baş bitikçimiz. Ulu xan Ata bitikçi deyiblər ona. Türkün ən qutsal bitiyini o yaradıb. Kimliyimizi bilmək istəyirsənsə onu oxu! Onda kimliyini tanıyacaqsan, keçib gəldiyimiz yollarla geri yürümək, Atalarımızın ilk varlığına qovuşmaq istəyəcəksən.

Bunu deyib daş taxçada üst-üstə qalaqlanmış dəri səhifələri göstərdi.

Beləliklə Qam Atayla Xaqan mağaraya bağlanıb Ulu xan Ağa bitikcinin yaranışdan bəri başından gəlib keçənləri ağlasığmaz bir gözəlliklə, sehirli bir dillə anladan boyların oxumağa başladılar.

Oğuz xaqanlığı da, eli də, Ərkonda onu gözləyənləri də unutmamışdı. İndi anlamışdı ki, Tanrı elçisi olaraq o dünyaya tək gəlməyib. Bu dinlədiyi təkcə keçmiş tarixlərin bilgisi deyil, həm də Tanrı sözüdür, yasadır, ömrün və dünyanın gizli qatlarına aparan yoldur.

Ancaq onu heyrətləndirən bir şey də vardı. Bu bitiyin bəzi səhifələrini, sözlərini bu əlyazmasını oxumazdan qabaq da bilirdi. El arasında gəzən nağıllardan, ata sözlərindən duymuşdu.

Bəlkə Ata sözü deyəndə də Ata bitikçini düşünürmüşlər...

Qam Ata borcunu ödəyibmişcəsinə yüngülləşdi və dedi:

- Xaqanım! Bu bitik bildiklərini bir daha bildirdi sənə. "Su gələn arxa bir də gələr" söyləmiş Ata bitikçi. Get, əski yurdları dirilt. Yıpranmış tapınaqları yeniləşdir. Unudulan qardaşlarımızı bayrağının altında dirçəlt.

Oğuz xan söylədi:

- Doğru dedin. Əski anıları diriltmək üçün o yurdlara varmalıyam! Ancaq necə? Günbatana yürürkən, bu günkü yurdlarımızı kimə buraxım? Çinəmi bağışlayacağıq?

- Yox! Çin çoxdan bəri Böyük Qobunun guneyindən divar çəkmək istəyir. Bizim yerlərin boz üzünə çinli dözməz. Sənin gedişin ulusun gedişi deyil. El yerində qalır.

Oğuz xan dedi:

- Bu işin bir yolu var! Gücümüzdən, yarlığımızdan, qılıncımızdan öncə Tanrıçılığımız, bir olan Yaradana inancımız getməlidir! Tanrıçılarımız yer üzünə yayılmalıdır. Buna yardımçı olmalısan!.. Mən bu gün

Ulu Tanrının türkün üstünə dikdiyi bir xaqanam, onun istədiyini hansı yolla olur-olsun yapacam. Ata Ünür varkən mən hər addımda bir onqon evinin qurulmasını istəmirəm. Göy Tanrıyla bizim aramız açıqdır. Körpü artıqdır. Tanrının mənə verdiyi üstünlüyü paylaşmıram. O, elçisi olmasa da uludur, ərklidir... Büt otaqları tikməyə, tapınaqlar ucaltmağa gərək qalmır, yaratığ yaradanıyla görüş üçün tapınaqlar, ayrıca günlər aramır, Tanrı hər an onun yanında, başının üstündə, könlündədir. Yaşamı at üstə, yollarda, yürüşlərdə keçən bir ulusa gərəkəni Tanrı özü bizdən yaxşı bilir. Olsun kim, bu üzdən bir olan Tanrı hər ulusa bir başqa yalavac göndərir, yaradanıyla ilişkilərini hər ulusun öz yaşamına uyğun qurmasını düzgün sayır... Tanrı adı ilə ulusun qanını soran yeni bir tanrıçı sürüsü yetişdirilsə, yanlış olar. Yer üzündə nə qədər türk varsa, hər biri özünü Tanrının elçisi saymalıdır...

Ata mağaraya dəfələrlə gəlib getmiş Oğuz xan yalnız bu gün anlamışdı ki, o, tapınaq haqqında az bilirmiş. Mağaranın gizlinləri açıldıqca o haldan-hala düşürdü. "Öz yaratdığımızdan, öz gördüyümüzdən özümüzün xəbərimiz yoxdur." - deyə düşünürdü Xaqan həm də elin inanc başçısıdırsa bu bəlgələrdən niyə xəbərsiz qalsın? Ancaq bu düşüncələr Oğuz xana başqa bir həqiqəti də anlatdı. "Görünür bunlar palçıq, dəri, ağac "tengriciklere" tapınanlar üçün deyilmiş. Bunlar hamısı Göy Tanrıya bağlıdır və gizlinləri də Qam Ata öz istəyiylə yox, Ulu Tanrının iradəsiylə açır.

Qam Ata Oğuz xanın düşündüyünü duyurdumu? Bəlli deyil. Görünən məmnunluğuydu. Tələsmədən, bəlgədən-bəlgəyə adladıqca, Oğuz xanı hər dəfə hey-

rətləndirdikcə qanadlanırdı. Sanki intiqam alırdı Oğuz xandan! Sanki "görürsənmi, nələr var burda. Bu qutsallığa insanın əli necə qalxar?" deyirdi ona. Bununla belə içindəki başqa bir səs ona "tərəddüd eləmə, bu gizlinlər məhz elə bu gənc xaqana açılmalıdır. O yeni bir yol başlayır. Hər şeyi anlatmalısan ona. Sonra gec olar," - deyirdi. O da öz işindəydi.

Bu həvəslə sandıqdan səliqə ilə bükülmüş ağ dəri bəlgəni çıxarıb açdı. Yağ işığında dərinin üstündə qızmar şişlə ya boyayla çəkilmiş cizgilər aydın görünürdü. Əslində bu da səkkiz bucaqlı damğaya bənzəyirdi.

- Burda, Ulu Tanrının yaratdığı yerlər, sular cizilib. Əkinçi, dəmirçi, mal-qaraçı atalarımızın min illərcə qurduqları uçmaq yerlərini burda bularsan. Yerin-göyün gizlinlərinə açar olan bir bəlgədir. Yer üzünün unudulmuş çağlarının, çox-çox əski ödlərin anısı, bəlgəsidir. Günbatanda, adları belə unudulmuş ən əski məskənlərdə yaratdıqları ellərin çökdüyünü, düzənin pozulduğunu görüncə bizimkilər yenidən Günəşə üz tutub gəlmiş, dağlara çəkilmiş, sonra "torpaqda qurulana güvənilməz", deyə keçə yurdları düşünüb, torpaqla, suyla, yaz-qışla baş-başa yaşamışlar. Türkü bu boz çöllərə, Qobunun, Tarımın sonu görünməyən qum dənizlərinə bağlayan nədir, düşündünmü? Kimsə sordumu bunu? Yüz illər boyu ən verimli torpaqlarda yaşayan yadlar dörd yandan soxulsa da, bu qumları atıb getmədik. Getdiksə də, yenidən ona dönduk. Bilən varmı bunun nədənini?

Oğuz xaqanın üzü yağ çırağından çox, eşitdiklərindən işıqlanırdı.

- Mən soruram, mənə söylə!

- İtlər sönmüş-soymuş ocaqlardan ayrılıb gedə bilmədikləri kimi, biz də yerlərə kömülmüş yurdlardan, burda yaşamış ataların tinindən-ruhundan qopa bilmirik, bundandır. Tanqutla Altay arası-Tarım irmağı boyu yerlər görkünü, yücəliyini göylərdən almış tanrısal yerlərdi.... Yazıtlarda belə yazılıb. İlkin çağlarda insan beş min-on min il yaşardı. Sonra özünü ölümsüz sandı. Tanrısını unutdu. Göylər qızdı, qum dənizini daşırtdı ora. Yer üzündə əkizi olmayan kəndlər, uçmaq yerinə bənzər bağlar, ormanlar, arxlar addım-addım uduldu qum axınıyla. Göylərin, yerlərin bütün gizlinləri Tanrının simgə dilində yazılmışdı, yalnız bilginlərin üzünə açıqdı. Tarım boyu ünürlərdə, kovuklarda, əllə yapılmış yeraltı kəndlərdə toplanan biliklər bütün gizlinlərin açarıydı. Onları düşünəndə buranı saxlanc, ağu saymamız gülməlidir. Çox-çox əski çağların bilikləri, Tanrının dili itirilib bir yolluq! Bizə qalan onların tozudur... Ancaq buna da sevin! Yaradan incəcik bir ipucu saxlayıb Ata Ünürdə. Tanquta gedən yolda, Qansu ormanında Danya koğuşlarında da nələrsə qorunur. Ancaq oxunmaz oldu, dil unuduldu. Unudulmasa, bütün örtülər qalxar, bütün başlanğıclar görünərdi. Qazlıq dağının güneyində yaranışımız, ordan Tarıma gəlişimiz, Tarımın qum altda kalması, Günbatana üz tutaraq çaylar arasında yeni bir düzən quraraq əski yurdların bütün bilgilərini yenidən diriltməmiz, sonra oraları da suyun basması, bir daha dünyaya səpələnməyimiz... yazıtlarda hər şey vardı... Aral dənizinə axan çayların axmaz olması da, Kaspinin daşarak Qazılık dağların yamaclarına qalxması da... Göylərdən gələn elçilər də...

Oğuz xan çox illər öncə babasıyla yürüş etdiyi İtil irmağını andı. Çayın o üzündəki yerlərin də türklər üçün doğma yurdlar olduğunu bilirdi.

Qam Atanın dəri bəlgəsi türkün köküylə bağlı düşüncələrini daha da genişləndirir, qaranlıqları aydınlaşdırırdı. Oğuz xan sordu:

- Bu cizgini almaq istəsəm?

- Yox, böyük xaqan, bu sandıqda qorunanlar Ata Ünürdən çıxarılamaz. Biz Tanrının kölgəsindəyik, təkcə bizim yox, yer yüzünün gələcəyi bu bəlgələrdən asılıdır.

- Açar tək olursa itməsi ölümdür, çox olursa heç bir qasırğanın, çal-çapın qorxusu qalmaz... Gizlinlər budunun bilginlərinə, yeni gələnlərə açılmalıdır...Mənim düşüncəm belədir...

- Doğru söylədin! Qurtuluş yolunu bilgidə görmək tanrısal insanların işidir, türk yolu budur... Bilgili kişidə ərklik, ərkli kişidə bilgi olmalıdır. Yalnız qılıncla iş aşmaz.

Qam ata sandıqları arayıb başqa bir dəri bükülünü çıxarıb Oğuz xana uzatdı və dedi:

- Mən bu bəlgənin ikinci üzünü verirəm sənə. Gedəcəyin yollar və yerlər burda çizilmiş. Bizim olan bütün yurdları, torpaqları burda tapacaqsan. Ulu Tanrı sənə bu yurdları birləşdirmək və oralarda yaşayanları yer didişmələrindən qorumaq tapşırığı verib. Sən onların başını dikəldəcək, üzünü Göy Tanrıya çevirəcəksən!

Tanrı damğasının, Ulu Xan Ata Bitikçinin hələ ki, yalnız bir bölümünü oxuya bildikləri "Ulu bitik"in hər biri bir möcüzəydi, hər biri yüz xaqan xəzinəsinə dəyərdi. Ancaq Oğuz xan üçün ən dəyərlisi sonuncu

bəlgəydi. Ruhunu yürüş havasının sardığı bir çağda bu dəri cizgi bütün qapıların açarı, bütün yolların bələdçisiydi. Ata Mağaraya onu çəkən nə idi? İndi duymuşdu! Sən demə Tanrının idadəsiylə burdakı oyuncaq bütləri yıxıb dağıdanda da, elə Mağaranın bu uzaq gizli yaddaş otağında qorunan bəlgələrin hökmü və istəyiylə, onlara və dünyanın sirlərinə qovuşmaq üçün hərəkət edirmiş. Bunu da onda anlamışdı.

Bura sabəcə bir tapınaq deyil, Tanrıya aparan yoldur, bu yolun itirilməsi dünyanın fəlakətləri olar. Tanrının elçisi olaraq onun ən böyük işi bu xəzinənin qapısını elinə-ulusuna açmaqdı.

Əslində Oğuz xan üçün söhbət tamamlanmışdı. Ancaq Tanrının yalnız ona verdiyi qeyri-adi bir həssaslıqla Qam Atanın yenə də nə isə demək istədiyini, "deyim, deməyim?" sualları arasında qaldığını duyurdu.

Savaşda uğurun bir yolu düşmənə seçənək imkanı verməməkdir. Elə həmin yolla üstünü aldı Qam Atanın:

- Daha bir gizlin var ürəyində. Nədən sözünü sona kimi demədin?

Qam Ata gülümsədi. Onlar bir-birini yaxşı başa düşürdülər.

- Saxladımmı? Yox. Söylədim hər şeyi. Bundan o yana gedə bilmərəm. Tanrının işlərinə əl aparmandan qorxuram.

- Sən Tanrı elçisiylə danışırsan, - dedi Oğuz xan. - Sözünü bitirmədiyini duydum.

Qam Atanın üzü sandığa çevrildi. Elə bil gözləriylə onu eşələyir, nə isə axtarırdı. Gözlərini divarlardakı anlaşılmaz, sehrli rəsmlərdə, işarətlərdə gəzdirdi. Sonra asta-asta sözə başladı:

- Bilirsənmi, böyük xaqan! Düzünə qalsa bu mağarayla bağlı olan hər şeyi söylədim sənə. Daha öncələr də insan oğlunun və budunumuzun keçib gəldiyi yollardan çox danışmışıq... Bu gün Tanrı damğasını, Ulu Xan Ata Bitikçinin kitabını sənə göstərəndən, atalarımızın ilkin yurdlarını, keçdikləri yolları göstərən dəri bəlgəni sənə verəndən sonra elə bil içim boşaldı. Anlaşılmaz bir qorxu bürüdü məni.

Oğuz xan Qam Atanın narahatçılığının səbəbini anlaya bilmirdi. Əlini Qam Atanın əlinin üstünə qoyub sakit bir səslə soruşdu:

- Səni qorxudan nədir? Ata Ürünün qədərinimi düşünürsən? Anlatdım artıq. Biz varkən bura qorunacaq. Çıraqlarının, yardımçılarının sayı artacaq.

Qam Atanın gözləri yol çəkirdi:

- Sənə inanıram. Bu sarıdan əndişəm yoxdur. Məni düşündürən kişi oğlunun və yer üzünün gələcəyidir. Görürsənmi, savaşın birini bitirməmiş, başqasına atlanırsan. İnsan yaranandan bir-birinə qənim kəsilib. Gün-zünü açıb-yumunca ömür bitir. Yan-yörəmizdə, gözümüzün qarşısında olan böyük nəsnələri görmədən, gizlinləri açmadan, Tanrı bilgilərinin qapısını döymədən köçüb gedirik. Bu bilgilər də getdikcə unudulur...

- Bu məni də düşündürür, - dedi Oğuz xan.

Qam Ata hələ də düşüncələrini toplaya bilmirdi.

- Biz nə qədər böyük bir yanlışlıq içində olduğumuzu bilmirik, böyük xaqan! Yaratıq, yəni bizlər incəcik bir ipdən asılıyıq. O da qırılsa əski dünyadan və Tanrıdan biryolluq üzülürük. Savaşdan, yürüşdən başın açılanda bunu düşündünmü? Bir gün düşün də sor özündən.

- Nəyi sorum?

- Sor ki, bunca xaqanlar içində Tanrı niyə səni seçdi? Nədən bütün türk xaqanları özlərini göydə olmuş və ya göydən gəlmiş sayırlar? Nədən qurbanlarımızı Ata Ünürdə kəsirik, bu naxışları divarlara kimlər çəkib? Bu yazıları, simgələri bizə kimlər öyrədib?

- Sormadım, düzdür. Sən sordunmu? Bəs sən niyə söyləmədin mənə?

Qam Ata gülümsədi və dedi:

- Bu da Tanrının istəyinə və hökmünə bağlıdır. Uzun yola çıxırsan. Gəlimli, gedimli dünyadır. Yeni görüşümüzü neçə il gözləyəcəyəm? Nə sən bilirsən, nə mən! Bu soruların cavabları bu incə ipin o ucundadır.

Əski çağlarla aramızda bir-iki titrək körpü qalıb, onlar da uçsa Tanrıdan gələn yollar büsbütün unudulacaq.

Oğuz xan yürüşləri də, Ərkon vadisini də, onu gözləyənləri də unutmuşdu. Bütün diqqəti Qam Atadaydı.

- Sən də körpülərdən birisən, elədirmi? - soruşdu Qam Atadan.

Qam Ata bu soruya cavab verməsə də üzündəki ifadə Oğuz xanın hədəfə vurduğunu göstərirdi.

- Tək mən deyiləm. Misir və Babil, Tanqut-Tibet kahinləri, şamanları da bu gizlinləri hələ unutmayıblar. Biz doğrudan da Göydən, Tanrıdan gəlmişik. Tanrı yerin ilk yaratıqlarını göydən endirmişdi. Onlar özlərinə "ər" deyirdilər. Bu gözlənilməz köçün səbəbini bilən yoxdur. Yeri insan məskəninə çevirmək istəmişdi, yoxsa fəlakətə uğramış başqa bir ulduzdan bura köçməyə məcbur olmuşdular, bilinmir. Onların ilk endiyi yerlər bu mağaralardı. Onlar yerə dil, bilgi gətirmişdir. İtirilmiş dünyalarının oxşarını burda yara-

dıb, yarımçıq qalmış işlərini burda davam etdirirdilər. Min illərlə yaşayan, yeri cənnətə çevirən, quş kimi göydə uçan onlardı. Mağaraların qutsallığı və qurban bayramları o çağlardan qalıb. Tanrı daşını da göydən onlar gətirmişlər. Oka bənzər, ilana bənzər uzun göy arabalarında gəlmişdilər. Sənin adın da onlardan qalmadı. İlana tapınmaq da. Özləriylə təkcə bir canlı gətirmişdilər o da qurddu. Göylülər gəldikləri yeri tez unutdular. Ancaq qurd unutmayıb. İndi də üzünü o uzaq dünyalarına çevirib ulayır. Qurdun bizi qoruyub saxlaması da bununla bağlıdır. Bu kökdən, əski yurdların birliyindən gəlir. Türkün qurda qardaş deməsi, onu qutsallaşdırması da bununla bağlıdır.

Oğuz birdən-birə İssık gölünün güneyində qayaya sıxıb oxladığı qurdu, onun həmin andakı baxışlarını xatırladı. Ancaq Qam Atanın sözünü kəsmədi.

Qam Ata deyirdi:

- Bizim yolumuz göydən gələn adamların ilk məskənləri arasındakı yoldur. Altay, Xantenqri, Buzlaq dağları, Misir, Tanqut. Nədən türklər bu yerlərdən dışarıya axmır? Çünki göydən gələnlərin ilk düşərgələri burda olub və onlar bu düşərgələr arasındakı əski yolların qoruyucularıdır. Sən birinci deyilsən, xaqanım, incimə. Bu yolu çox Oğuz xanlar keçib...

Qam Ata sözünə ara verib Oğuz xana baxdı. Onun bu sözləri necə qəbul edəcəyini bilmək istəyirdi. Ancaq Oğuz xanın gözləri hardasa mağara divarlarından da uzağa, məchul bir nöqtəyə dikilmişdi.

Qam Ata bildiklərini dilə gətirməyə çətinlik çəkirdi. Ən başlıcasını demişdi. Oğuz xan onun susduğunu görüb xəyaldan ayrıldı.

- Sonra? Sonrası nə oldu, - deyə soruşdu.

- Sonra yavaş-yavaş göydən gələn kişilərin nəsli kəsildi. Tanrımı qızdı onlara? Yoxsa öz aralarında savaş başladı. Bəlkə öz məskənlərində başlanan toqquşmalar davam edirdi? Bilmirəm. Yazılar bunu açmır. Ancaq fəlakət birdən aldı üstəlirini. Bütöv bir qitə suya batıb, qurduqları cənnət guşələri qumların və buzlaqların altında qalıb. İzləri tamam itib getməsin və dünya boşalmasın deyə Tanrının buyuruğuyla torpaqdan bu günün kişilərini yaratdılar. Bu gün sənin yaşadığın Tanrı dini də onlardan qalıb. Bu günün kişiləri torpaqdan yaranıblar. Göy adamları torpaqdan öz bənzərlərini yaratmağı bacarırdılar. Ancaq bunu çox gizli edirdilər. Ərkon da onların gizli insan yaratma yerlərindən biriydi. Bu izləri itirmək üçün sonralar buranı dəmir əridilən bir yer kimi tanıtdılar. Yer üzündə Ərkona bənzər Ana yurdlar neçə dənədir - bilmirəm. Göydən gələnlər bir cürdü. Ancaq yaratdıqları seçilir. Bəlkə də torpağın çeşidlərindəndir. Bu da Tanrı buyuruğudur. Buna görə köhnə kitablar, göydən gələnlərin dili, əski kitablar belə sürətlə məhv edilir, unutdurulur, Yerdə yarananlar, göydən gələnlərlə öz aralarındakı ayrılığı silib itirməyə çalışırlar. Bu divarlarda gördüklərin Göy adamlarının yazılarıdın və onların dilindədir. Mən özümü düşünmürəm. Bir gün Ata mağara və Tanrı oğullarının başqa belə düşərgələri olmasa - bu həqiqətlər bir yolluq unudulacaq...

Oğuz xan bir nağıl dinləyən kimi dalmışdı.

Birdən-birə hər şey aydınlaşdı. İllər uzunu bu mağara görüşlərində Qam Atanın qapalı, qırıq-qırıq sözlərinin, göylər və ulduzlar, ruhlar və mələklər

haqqında, insanın tanrısal gücü, keçmişi və gələcəyi görmə qabiliyyəti, yuxularının mənası, uçmağı bacaran, yeraltı aləmə gedən insanlar haqqında söylənilənlərin hər biri aydın bir anlam qazanmışdı. Dünya və insan tarixi nizama düşmüşdü.

İndi qarşıdan yürüşlərə onu çəkən duyğuların hardan qaynaqlandığını daha yaxşı anlamışdı və bu yürüşlərə basqın kimi yox, bir ziyarət kimi baxırdı.

Yəqin seçilmişliyinin, Tanrı elçisi olmağının bir səbəbi də buydu.

Ayrılarkən Qam Ata bayaqdan gözünü ayırmadığı sandığın dibindən indicə gürz altından çıxıbmış kimi parıltısı göz qamaşdıran bir qılınc çıxartdı. Əlləri üstə onu Oğuz xana uzadıb dedi:

- Bax, bu göydən gələn Tanrı dəmirçilərinin işidir. Bu qılıncla Tanrının ürəyinə doldurduğu söz birləşəndə qarşısını kimsə ala bilməz. Tanrı hər zaman səninlədir. Yolun açıq olsun.

Oğuz xan yarımqaranlıq mağaradan tam işıqlanmış çıxdı. Aradığını bulmuşdu. Yer böyümüş, göylər yaxınlaşmışdı.

Düşərgəyə dönəndə Oğuz xaqan söyləmiş, görəlim nə söyləmiş:

Bögüləri, bilginləri qoru!

El gedər, törə getməz. Yol bitər, bilgi bitməz!

Tün-gün tapın Tanrıya, boynamagil; Qorxub ondan, eymənib oynamagil!

Bilginlər bilgisi geyimlə aşdır, bilgisizin qılıncı yararsız arkadaşdır.

Yenə Oğuz xaqan demiş:

Dilin görkü söz, kişinin görkü üz, üzün görkü yüz.

* * *

Hindin quzeyinə göndərilən elçilər Oğuz xanı Issıq gölünün güneyindəki düşərgəsində tapdılar.

Onlara baş əymiş, el olmaq, bağlanmaq istəmişlər.

Xan ayın bədirlənməsini gözlədi. Dan yeri ağaranda, bayrağını açdı. Borular səsləndi, davullar vuruldu, at ayağının səsi gölü ləpələndirdi. Az sonra səssiz-səmirsiz bir düzənlə hər kəs köçdə yerini tutmuşdu.

* * *

Hind elinin quzeyində, böyük bir yurdda Oğuzu dəstəkləyən Uyğur elinə yavuq olan bir ulus da vardı. Başçıları Yağma xan Oğuzun gəlişini açıq könüllə qarşıladı. Yoluna çıxdı, ağırladı. Əski düşmənlərindən öc alınacağına sevindi. Əl verib Oğuz xanla el oldu. Ona bağlandığını, hər il vergi verəcəyini bəyan etdi. Bundan sonra Oğuz xan dağ aşırımlarından, uçurumların üstündəki asma körpülərdən keçərək, çətin bir yol adlayıb gündoğan tərəfdən Uludağ bölgəsinə girdi. Ölkədəki başıpozuqluqdan çana yığılmış əhali onların gəlişinə sevindi. Bir ay dincəlib yolları öyrənəndən sonra irmaqların quşatdığı İkaryaya yürüdü. Kələkləri, tulumları üfürtdürüb, üzərək çayı keçdilər. İkaryalılar göz açıb yumana şəhəri oğuzların əlində gördülər. Şölənlər quruldu. Oğuz vergi darğasını qoyub geri döndü.

* * *

Getdikləri yolla dönərkən arxadan çaparlar gəlib yetdi. Yağmur Oğuz xaqanın geri dönməyəcəyini sanıb baş qaldırmış, onun ərənlərini qovmuşdu.

Xaqan durdu. Eli yaylalarda buraxıb bu dəfə yığcam atlı bölüyüylə geri döndü. Yağmur xanın gücünü görmüşdü. Əsgərlərini zora salmadan onun qoşunlarını darmadağın etdi, özünü öldürtdürdü.

* * *

Hind elindən dönən Oğuz xan yurdun içinə daldı. Aylarla Talasda, Sığnaqda, Ortaqda, Alatauda dolandı. İnci boyu yurdlara, döyüş ərlərinin torpaqlarına baş çəkdi. Yengikəndin tikintisinə başlatdı. Özül qoyanları donatıb bəzətdi. İç yürüşlərdə Uslu Xoca onun yanında sözdaşı, gənəkçisiydi. Onun oğlu Qutluq hələ də Çindən dönməmişdi. Bütün gözləmə çağları keçmiş, ancaq gedənlərdən soraq gəlməmişdi.

Tanrının yardımı ilə bu itkinin yeri boş qalmamışdı. Minatlıbaşı Ərgənin qızı Elbilgə təkcə görküylə yox, üstün düşüncəsiylə də ad çıxarmışdı. “Mən Qutluqun deyiklisiyəm!”, - söyləyibən neçə elçi qaytarmışdı. Hər dəfə gün işığıyla bir Uslu Xocanın alaçığına girəndə yerin-göyün sevincini doldurardı onların ürəyinə.

Çiçəkdən incəydi, ancaq at sürməkdə, qılınc çalıb-ox atmaqda ərənlərdən geri qalmazdı. Bayramlarda ağ ürgəsinin yaraşığına dururdular. Uslu Xocanın güvən, onur yeriydi Elbilkə. Tanrı onu bir evin dirəyi, yaraşığı yaradıbmış! “Oğluma oğul doğacaq, sirdaş, çiyindaş olacaq... Bircə qayıtsaydı Qutluq!.. Düyün qurub, diləklərinə çatdırardıq, ürəyimiz yerinə gələrdi.”

Qutluğun Elbilgəni tanıyıb könül verməyi də qəribə olmuşdu. Bir gün yaylada Qutluq ovdan obaya dönərkən qayaların arasından keçən sərt yoxuşun ətəyində böyrü üstə uzanıb başını otların arasına soxmış bir at və atın yanında hələ bığ yeri tərləməmiş yaraşıqlı bir gənc görmüşdü. Tanımırdı, görünür qonşu obalardandır.

- Atına nə olub? - deyə sordu.

Yeniyetmə başını qaldırıb Qutluğa baxdı:

- İlan vurubmuş, bilməmişəm. Birdən-birə şişməyə başladı, sonra yerə gəldi. Heyif!

İnsanın qanadı muradı olan at zəhərə dözümsüzdür. Görünür Tanrı onu yalnız şirin və xoş münasibətlər üçün yaradıbmış.

Aşağıdan yuxarıya baxan gəncin gözlərində qəribə bir ifadə, peşmançılıq ağrı duyulurdu. Bu baxışlarda ağlasığmaz bir çəkicilik vardı. Ancaq Qutluq bunu hiss etmədi. Onu burda qoyub gedə bilməzdi. Soruşdu:

- Sən də mi ova çıxmışdın?

- Hə.

Soruşmasa da bilirdi. Yıxılmış atın yəhərindən bir neçə çöl quşu asılmışdı.

- Hansı obadansan?

- Soyuqbulağın üstündə düşmüşük.

- Bizə qonşusunuz ki. Aşırıl atın tərkinə, aparım.

Gənc bir anlığa duruxdu, ancaq təklifi qəbul etməkdən başqa yolunun olmadığını bilirdi.

- Bəs atın yəhər-yüyəni?

Qutluq atdan enib ilan vurmuş atın yəhərini, yüyənini açıb quşları gənc həmsöhbətinə uzadaraq qalan şeyləri üsulluca toparlayıb kənardakı daşların arasında gizlətmiş və:

- Sabah gəlib götürərsən demişdi.

Atın belinə sıçrayandan sonra yeniyetməyə də tərkinə minməyə yardım etmişdi.

Köndələn yolda yeniyetmə ona toxunmadan atın çılpaq sağrısında oturmuşdu, amma yoxuş başlayanda sürüşüb düşməyin qorxusundan yəhərin içinə aşırılıb Qutluğa sıxıldı. Qutluq ötkəm səslə:

- Yaxın otur. Tut belimdən! Yoxsa bu yoxuşda atın üstündə qala bilməzsən dedi. Gənc onun belindən yapışdı.

- Bax belə.

- Qutluq istər-istəməz oğlanın onun belinə dolanmış əllərinə göz yetirdi və bu əllərin oğlan əlinə bənzmədiyi diqqətindən yayınmadı, zərif uzun barmaqlar incə biləklər qız əlinə oxşayırdı. Ancaq ürəyinə başqa şey gəlmədi: "İncə-mincə oğlanlardandır yəqin, deyə düşündü. Yoxsa atını ilana çaldırmazdı."

Yoxuşda bir az da şaşırdı. Yeniyetmənin onu bərk qucaqlamaqdan başqa yolu qalmamışdı. Qutluğun kürəyinə iki möhkəm yumruq sıxılmışdı elə bil. Bu nədir? Nə geyinib bu oğlan əyninə...

- Kimlərdənsən obada? Mən hamını tanıyıram.

- Min atlı başı Ərgənin... deyib susdu və azca ara verəndən sonra yavaş səslə əlavə etdi: - oğluyam.

Qutluq dinmədi. Ancaq sonra özünü saxlaya bilmədi:

- Mən biləni Ərgənin oğlu yoxdur!

Tərkindəki yeniyetmədən cavab gəlmədi və bu yerdə birdən-birə elə bil Qutluğu ildırım vurdu. Hər şeyi anladı. Ayaqlarını atın qarnına sıxdı ki, sürətini artırsın və tərkindəki ona daha bərk sarılsın.

Bundan sonra daha heç nə danışmadılar. Sirr açılmışdı.

Bir neçə gün keçmiş Qutluğ atını Soyuqbulağdakı obaya sürmüş və bulaq üstündəki qızlar arasında gənc ovçunu - bu dəfə qız paltarında görmüş və bir könüldən min könülə ona vurulmuşdu. Bulaqdakıların arasında nə deyəcəkdi ona? Ancaq qarşılaşan baxışları və qızın üzündə zorla seçilən utancaq təbəssüm hər şeyi söyləmişdi: "Əlbətdə, mənəm! Sənin axtardığın ovçu oğlan mənəm."

Oğuz xanın uzaq ellərə gedən elçilərinin çoxu dönmüşdü. Getdikləri yerlərdə Oğuz elinə qoşulmaq istəyən, boyun əyənlər də vardı, ötkəmliklə "gələrsiniz, danışarıq" deyənlər də. El içində düzən qurandan, günçıxandan, güney yönündən qorxusu qalmayandan, yapma onqonların köləliyindən çıxa bilməyən əmiuşaqlarını qovub, kadırğan meşələrinə doldurandan sonra Oğuz xanın ilk arzusu günbatana yürüşdü. "Qam Ata demiş, əski yurdların qapılarını açalım! Eli yer üzünün sonunadək yayalım. Günbatan-gündoğan arasında bayrağımın kölgəsinə sığınmayan yer qoymayalım!", - deyirdi. Ancaq bu arada güneydən elçinin gəlişi düşüncəsini dəyişdi. Beşsu oymağında elçilərini kobud qarşılamışdılar.

Havalar sərinləşib axın çağı yaxınlaşanda İnci vadisində xaqan çadırının yan-yörəsinə ərənlər toplaşmaqdaydı. Xaqan bu bölgədə zaman itirmək istəmirdi. Bunun üçün Gur, Garçi, Əfqan tərəflərə daha ağır basqı, qorxu bitikləriylə, yeni elçilər göndərdi: "Bu, Böyük xaqan tərəfindən Ulu Tanrı adına verilən buyruqdur. Bizə qatılıb, bayrağımızın kölgəsinə sığı-

nıb, vergi ödəyəcəksiniz. Yox deyilsə əyilməyən başlar, uzanılan əllər kəsiləcək. Tanrının istəyi yerinə yetiriləcək”.

Yola çıxmazdan öncə Oğuz xan yenə Uslu Xocayla birgəydi. Elin keçmişi, gələcəyindən, türk uluslarının durumundan danışırdılar. Yaşamın ağırlığı, sərt qış, boz çöllər, yağmursuz yer ulusu sınağa çəkirdi. Uslu Xoca:

- Ulu xaqan, bunlar yaradana bağlıdır. İllərin də yaxşısı, pisi olur. Ayı, günü, ulduzları xaqan idarə edə bilməz. Xaqanın borcu el-ulus qarşısındadır. Sənin el qarşısında iki borcün var. Xaqanlığın əsli-kökü bu iki işin başa çatdırılmasına bağlıdır. Bunlardan biri törənin qorunmasıdır. Düzənin pozulmaması, kimsənin unudulmaması, birinin malına başqasının yiyələnməməsi, xalqa çatacaq pay-ülüşün kəsilməməsi... İkincisi, sənə qulluq göstərənlərin qorunması, uca tutulması, onlara düşən altunun, gümüşün yubadılmadan dağıdılmasıdır. Törə ilə ulus sevinib-yaşamalı, qulluq göstərənlər də gərəkən ücrətlərini alıb, el malına, qonşu malına göz dikmədən, ağ üzlə çalışmalıdılar. Çərinin ayaq təri, çobanın donluğu, titikçinin güclüyü, qaravaşın, qulluqçunun özlüyü, elçilərin, ordu başçılarının yelimi, kəsimlikləri[164] çağında, qısıntısız verilməlidir. El düzənə girsə, ürəyin və yaşamın da düzənə girər. Elin malını yeyənləri yer yeyəcək. Elin malını yemək onun ürəyini oxlamaqdır, törəni pozmaqdır. Sənin qılıncın törəni, haqqı, düzgünlüyü qorumalıdır. Əsgəri sevindirməsən qılıncı qınından çıxmaz.

---

[164] Ayaq təri, donluq, güclük, özlük, yelim, kəsimlik... — əmək haqqı növləri

Altunu özün üçün yığma! Ərənlərin üçün yığ! Altun əsirliyi içki öyrəncəliyindən daha qorxuludur. Yartmağ[165] saç[166], qoy igidlərin ordundan saçılmasın, dağılıb getməsinlər. Qılıncın el bəkçisi olsun!.. Buyuruğunu göylərin hökmu kimi, iti bir dillə ver!

Bu söhbət uzun sürdü. Oğuz xanı öndəki yürüş düşündürürdü. Uludağla İkariyadan eli bir neçə il yedirib geyindirməyə bəs edəcək bacla qayıtmışdılar. Qarşıdakı yürüşün daha uğurlu orlacağını gözləyirdi . Qoşaçayarasından Beşsuya keçib ordan varlı, savaş görməmiş bir elə varacaqdılar. Bu, son illər quraqlıqdan qovrulan yurdların yaşamını asanlaşdıracaqdı.

Uslu Xoca bu yürüşü uğurlamışdı, ancaq bu gün təkcə yürüşdən yox, Oğuz xanın gələcək yollarından, elin qədərindən, yazısından danışırdılar. Xoca deyirdi:

- Böyük xaqan, səni üstə göy, altda yer elin böyüyü seçdi. Göy səndən üz çevirməyincə, yer ayağının altından qaçmayınca uğur səninlədir. Türk xaqanları üç ayaq üstündə durar. Hökm, qut, alın yazısı... Üçü də səndə var. Tanrı yarlıq verib oturtdu səni uca Onur Yerində. Səni başqa kişilərdən seçib qut ilə donatdı, uğurunu da əsirgəmədi. Ürəkli get, uğurla dön!

---

165 Yartmağ — pul-para

166 Saçmaq — paylamaq, dağıtmaq

## QUTLUĞUN DÖNÜŞÜ

Yurdda yürüş havası vardı. Atlar bəslənir, ərənlər obalardan daranıb gəlir, dəmirçilər gecə-gündüz bilmədən, yorulduq demədən odlarını püskürüb dəmir döyür, araba təkəri, ox, mizraq, təmrək düzəldir, qılınc çəkirdilər. Alaçıqlarda yır-yığış gedir, orduda atış-ötüş yarışları ara vermirdi.

Axın türkün dəli sevdasıydı. Ozana ilham gələn kimi gəlirdi yürüş havası. Bu ruhu ilxılar, sürülər də duyurdu. At dırnaqları yeri nağara kimi çalır, sazlar, qopuzlar, çuxurlar yola çağırmaqla yanaşı, əski yurda ağlayırdı. Tanrı türkü tapmaqla itirmək üçün yaratmışdı. Bütün yaşamı əskinin ağrısı, yeninin sevinci arasındaydı.

Ozanların qoşqularında ellə sarmaşıb ayrılmaq, ocağı Tanrıya tapşırmaq, gediləcək yollara günaydın demək, ölümlü-qalımlı axının sonucuna uğur diləmək, Tanrıya yükünc qılmaq kimi könül qışqırıqları, yerlə göy arasında kişi oğlunun yaşantılarının ilginc duyğusallığı, çalın-çarpaz anılar, sızıltılar qovşağı vardı.

Sonsuz qobulardan ötən, yellərin soyuq iniltisiylə ulusu ardınca səsləyən Boz qurdun ulartısı qarışmışdı söyləmələrə:

Tünlə durub köçəlim,
Kara sular keçəlim,
Yağı başın biçəlim
İndi bizi kim tutar...

Dölək atlar yortarız,
Yollar bağrın yırtarız,
Yer üzünü örtəriz
İndi bizi kim tutar!..

Bütün yürüşlərdə olduğutək yenə kişilərin üzü göylərəydi. Tanrını öyür, uğuru ondan diləyirdilər:

Sən ögdən doğmadın, sən atadan olmadın,
Kimsə payın yemədin.
Kimsəyə güc etmədin,
Vurduğunu unutmayan, Ulu Tanrım, hu!
Basdığını bəlirtməyən, bəlli Tanrım, hu!

Yücələrdən yücəsən,
Kimsə bilməz necəsən,
Birliyinə sığındıq,
Bəngülük böyləcəsən...
Sən göydəsən, sən yerdəsən, Ulu Tanrım, hu!
Ulusumun könlündəsən, Görklü Tanrım, hu!

Uzaqdan-yaxından gələn bu çalğıları, alqışları, yalvarışları dinləyən Oğuz xanın içində duyğular qasırğa qoparmışdı. Yağmur daşı gedəndən sonra, doğrudan-doğruya, quraqlıq Çindən Quzeyə adlamış, Qobuya, Qoşaçayarasına, böyük yazıya, görünməmiş bir

susuzluq üz vermişdi. At ilxıları, dəvə qaytabanları, qoyun, mal-qara sürüləri üzülürdü. Bu üzüntü son dönəmdə el-ulusu Karacüğdan, Almalı yönündən İnci boyuna sıxır, qol-qanad açmağı əngəlləyirdi. Bu sıxıntı içində Qam Atanın sözləri bir təskinlik kimi dolanırdı başında: "Yurd bütövləşməlidir. Tanrının bəlgüsünü[167] daşıyan daş da bəngü deyilmiş. Ölümsüz olan, sonsuzluğa yol açan ulusun birliyidir. Dilini, özlüyünü, torpağını, yol-törəsini qoruyan el-ulus Tanrı sevgisi altında ölümsüzdür."

Ozanların səsində də Qam Atanın dediyi bir ölümsüzlük, sonsuzluq havası vardı. Amma oxular birdən xırp kəsildi. Yurda səs düşdü. Uslu Xocanın oğlu Qutluq Çindən dönmüşdü. Babasının-anasının əllərini öpməzdən öncə saraya vardı. Xaqanın önündə bağır basıb, gözləri yaş dolu, əliboş döndüyünü dedi. Yağmur daşı tapılmamışdı. Çinin güney saraylarına yol tapıb o yörədəki bütün tapınaqları aramışdılar. Bulunmamışdı. Ulusun Tanrı daşı dediyi, ancaq qamların ölməz sanıb Bəngü, Əbədi adlandırdıqları daş əbədi deyilmiş, ölmüşdü. Bir damla kimi Çin dənizinə qatılıb yox olmuşdu. Oğuz xan iki ildən artıq sürən bu axtarışın bütün ayrıntılarını, hansı oymaqlardan keçdiklərini soruşdu. Bu soraqlaşmada xaqanı sevindirən Çində savaş sonrası bağlanmış barışı pozmaq istəyinin duyulmamasıydı. Karvan-arğışlarla türk ellərindən toxunulmaz keçib gedirlər. Quzeydən gələn axınlar dayanıb, ölkə sınırlarında, yurd yaxalarında basqınlar dayanıb, savaş qorxusu yoxdur, demək,

[167] Bəlgü — nişan, əlamət

Oğuzun vergisi - payı dəmində göndəriləcək. Üstəlik Çinin quzey bölgələrində yaşayan türklərin gücü artır. Birləşə bilsələr Çin xaqanlığı yenidən türk bəylərinin əlinə keçəcək.

Bu sözləri söyləyəndən, soruları aydınladandan sonra Qutluq bağır basıb qalxdı.

Oğuz xan:

- Bunalma! Sizdən sonra daş bulundu. - dedi. Dincəlin, qarşıda uzun yol var.

Saraydan çıxınca Qutluq atını kəndin qırağında, ormanlıqda onu gözləyən yoldaşlarının yanına sürüb söylədi:

- Böyük xaqana vardım. Gözümüz aydın, daş tapılıbmış! İndi dincələ bilərik. Ancaq öncə məni evimizə ötürün. Birgə çıxaq anamın-babamın üzünə...

Nədəni Qutluğun yanında at üstündəki Çin qızı Li Şan idi. Özünü türksoylu tabqaç qızıtək tanıdıb sevdirsə də, türklükdən əsər qalmamışdı. Dili bilmir, Çin törəsincə yaşayır, ancaq Qutluğu sevir. "İki ildən ötdü, Elbilgə gözləməz. Anası-babası da "gəlmədi, evdə çürüməyəcəksən, eldən birini bul, get" söyləyib vermiş olarlar onu"- düşüncəsiylə Çin qızına könül vermişdi. Alıb-gətirmək zordu, ancaq xaqanın, babasının ümidlərini qırıb, sevdiyinə görə Çində qalması daha çətindi. El qınağını göz altına aldı, qızı buraxmadı. İndi uzun yolları keçəndən sonra gücünü toparlayıb anasının-babasının üzünə çıxmalıydı. Çində buna Tanrının yazısı, başa gələn bir iş kimi baxırdı. Ordaya girib, el içinə qayıdandan, Çinin qurulu kəndləriylə tutuşdurula bilməyən doğma yerləri, ağır durumda yaşayan ulusunu görəndən sonra bu evlilik ona anlaşıl-

maz görünürdü. "Tanrı buyruğudursa da da, görünür, Çin Tanrısının buyruğudur". Yoldaşları ürək-dirək verə-verə onu evlərinə ötürdülər.

At ayaqlarının səsinə Uslu Xocanın ürəyi düşdü. Qapıya çıxaraq tək-tək hər birini bağrına basdı. Oğlunun yanında çinli qızı görəndə duruxdu, Qutluğun qızarıb-bozarmasından işi duydu. Heç nə demədən çadıra döndu:

- Üzü ağ olsun oğlunun, al gətir gəlinini, - deyib xanımına bozardı.

Ancaq xanım, gəlin hayında deyildi. Oğlunu duz kimi yaladı:

- Öfkə qalmadı bizdə. Öldünüzdən-qaldınızdan soraq verən də yoxdu...

Sonra çinli qızı da qucaqlayıb öpdü:

- Balalarımız qayıtdı, Tanrım, - dedi.

Dışarıdan evlənmək turklərdə yasaq sayılmazdı. Ancaq böyük xaqanın tapşırığıyla göndərilən oğlunun könül şıltaqlıqlarına uyması Uslu Xocanı üzürdü. Ulus necə baxacaqdı? Bəs bu iki ildə onlara oğul olmuş Elbilgə? "Ata adını yürütməyən xoyrat oğul ata belindən enincə, enməsə yey!", - deyib çadırına çəkildi.

* * *

Elbilgə Qutluğun dönüşünü eşidincə, göyə tullandı. Ancaq yanına salıban yurduna bir çinli qız gətirdiyini duyunca, göydən yerə çırpıldı. Öncə nə edəcəyəni bilmədi. Sonra torpağa döşənib hönkür-hönkür ağladı. Qutluğa sevgisi, günləri saya-saya dönüşünü gözləməsi, evlərini öz evi bilməsi bir yana, bəs el içi-

nə necə çıxacaq? Qız-gəlinin yanında nə deyəcək? "Ulu Tanrım, öldür, apar məni!" dedi. "Ölüb gəlməsə bundan yaxşı olardı!"

Dan qızaranda ağ ürgəsinin belinə sıçrayıb, çöllərə üz tutdu. Didərgin düşdü. Gündüzlər gördüm deyən olmadı. Yalnız gecə yarıdan keçəndə ata-anasını qırmamaq üçün alaçığın qapısını qaldırıb, səssiz-ünsüz yerinə uzanardı. El qınağı Uslu Xocaya olan sayqıya dəyib dayandı. Söz böyümədi. Yürüş havasında ayrıca çadır tikib Li Şanla yaşayan Qutluq da unuduldu.

* * *

Gecə buludlar şəfəq sağılmış kimi al qırmızıydı. Bu uğur göstəricisiydi. Eldə "Gecə bulud qızarsa, evdə bir çocuq doğmuş kibi olur." deyərdilər.

İlıq dan əsintisi çadırların arasında vıyıltıyla dolaşıb, Boz qurd səsinə bənzər səslər çıxarırdı.

Yürüş boruları hər kəsi köçdəki yerinə çağırırdı. Səssiz-küysüz, öyrənilmiş bir düzənlə yola yığışırdılar.

Dan ertə Oğuz xaqanın ordusu üzü güneyə axdı. İncinin sol yaxasına adlayıb əski el yoluyla dikəlib, yalı aşanda, öncə Gündoğandakı uzaq Qaraca dağların başı qızardı. Sonra dan işığı tovuz quşunun quyruğu kimi üfüqü bürüdü. Köç dayandı. Başda Oğuz xan, ərənlər çevrilib, arabadakılar araba üstündən, atlılar at üstündən, yayalar-piyadalar diz yerə qoyaraq günəşə üç dəfə bağır basdılar. Gün işığı köçün damarlarından dolanıb keçdi. Qılıncları ovxarladı, yolları pambıqla döşədi.

Köçün içindən kiminsə səsi səhər quşlarının səsini batırırdı.

* * *

Güney yollarıyla Oğuz eli toya gedəntək yürüdü. Bu arada öncə göndərilmiş elçilər də onlara qarşı gəldilər. Gurda elçini sayqıyla qarşılayıb, "sözləşib bağlanalım", demişdilər.

Bir neçə gün sonra Gur yaxasında az sayda bir orduyla, ağ bayraqla onları qarşıladılar. Gur hakimi Oğuz xana qarşı yeridi, at üstündəcə salamlaşdılar. Danışıb söz kəsdilər. Bir neçə gün sonra Gur başçısı yurdunun dörd dövrəsini yağıların sardığını, bu üzdən yardım dilədiyini, sözləşmələri baş tutarsa, hər il gərəkən vergini ödəyəcəyini bildirdi.

Oğuz xan Gur elinin düzəninə toxunulmayacağını, törələrinə, yasalarına sayqıyla yanaçağını bildirdi. Gur başçısı özünə kiçiklik saymadan: "Qonşuların dilini, onları yola gətirməyin yolunu bən bilirəm!.." deyərək bir bölük seçmə Oğuz atlısıyla çaparaq getdi.

Oğuz xanın atların rənginə görə düzülmüş ordusu yaz çəmənlərinə bənzəyir, könül oxşayır, bu görküylə daha çox qorxu yaradırdı. Bu ordunu görən qonşular, ta Qəznəyə, Kabula qədər, savaş istəmədiklərini, anlaşıb vergi ödəyəcəklərini söylədilər. Ordu dincəlmək üçün dağ ətəyində, irmaqların üstündə düşərgə saldı. Gur hakimi el olmaları şərəfinə şölən yapdı. El güney yürüşündən savaşsız, itkisiz başı göylərdə döndü. Dönərkən Oğuz xaqan bəylərinin igidliyindən qürurlanıb, baxalım, nə söylədi:

Aslanlara köpək baş olarsa, aslanların həpsi köpək kimi olur.

Budun pozularsa, bəylər düzər. Bəylər pozularsa, kim düzər?

Qılınc bəkçi olursa, bəy hüzur bulur.

Qılınc qımıldansa, yağı qımıldanmaz.

Günəşdə yarıq, bəydə caymaq[168] yox.

Yerin başı dağ, elin başı bəy.

Adı, ünü bəlli, üzü ağ, görklü bəylərim, ərənlərim, seçkinlərim, yücələrim, igidlərim! Dəyəriniz düşməsin. Elmizin, Tanrımızın qarşısında başınız həmişə uca olsun.

* * *

Yurdun dərdi yurdda qalmışdı. Təkcə Elbilgə qovrulmaqda, yol aramaqdaydı. Güney yürüşündə o da atdan enmədi, babasından ayrılmadı. Uzaqdan-uzağa Qutluğu gördükdə ürəyi paralandı. Yayınıb üz-üzə gəlmədi. Görsə, söz açılsa yumşalacağından qorxdu. Öc almasa soyumazdı. Yürüşdə əl qaldırsa, ulusa səs düşər, savaşan ərlərdən biri azalar, hər kəs onu suçlardı... Axın çağları el yay təki gərilir, ovunun üstünə atılmağa duran aslana dönür; belə çağlarda el içinə qan salmaq qolları boşaldar, yürüşə pozuqluq gətirərdi. Elbilgə bunu eləmirdi, dözürdü.

Köç yurda dönəndən sonra şölənlər günlərcə sürdü.

Ayın dolub yeri-göyü işıqla görkləndiyi bir gecə, qanının necə axdığını, ürəyinin necə atdığını eşitdiyi bir dəmdə çadırların kölgəsindən keçərək Qutluğun ağ

---

168 Caymaq — çaşmağ,yanlış

alaçığına yanaşdı. Qalın, keçə qapı yanlardan hörülməmişdi. İçəridən səs-səmir gəlmədiyindən qapını qaldırıb girdi. İllərlə ürəyində gəzdirdiyi ulus əréni, könül verib sevdiyi Qutluq çadırın açıq dünlüyündən duşən ay işığında xanımıyla bağır-bağıra yatırdı. Donub qaldı. Bu, onun yeriydi. İndi elinə asi olan bir ölkənin dəvə tüpürcəyi kimi ağaran ruhsuz ləçərinin olmuşdu. Doymazsızcasına baxdı. Qıyya çəkib ağlayardı, "sındı", deməsəydilər. Çinli qız içində sevinərdi. Qarşısındakının kimliyini unudaraq, ay işığında bu uyğuya bənzər görüntüyə baxdıqca baxdı, ürəyi oyuldu. Gözəl, qıyılmaz bir görüklükdü[169]. Üzlərində donan mutlu gülüş ay işığında cilvələnirdi. Sanki bir-birinə baxıb sevinirdilər. Bəlkə də Elbilgəyə gülürlər. Olsun kim, onu görüblər, ancaq duyurmamaq üçün özlərini yatmışlığa vurublar. Elbilgə ürəyində: "Tanrım, bu sevinci necə pozum, bu uyğuya necə qıyım?" - sordu.

Sadaqdan bir ox çıxardı, döşəməyə sancıb qapını açdı, çadırların arasında yox oldu.

Üç gün keçdi. Qutluq oxu tanımış, amma xanımına heç nə deməmişdi. Deyib də nəyi dəyişəcəkdi? Gedib Elbilgəni arasınmı? Aradı-buldu, nələr oldu, nədən yapdım bu işi deyəcək? Onsuz da Elbilgənin ondan sonra ata-babasına etdiyi oğulluq, sözünü tutub, onu gözləməsi Qutluğu sarsıtmış, içində Li Şana olan duyğusunu darmadağın etmişdi. Di gəl, nə addım atacağını kəsdirə bilmirdi. Atının başını çöllərə döndərdi. İlxıların, sürülərin yanından sıyrıldı. Cilovu boş görən at alıb aparırdı. Göylər yuyulmuş kimi mas ma-

---

[169] Görüklük — mənzərə

viydi. Bu maviliyin bir parçası da yaylanın ətəyinə qonmuşdu. At bu suvat gölünü tanıyır, ora uçurdı. Elə bu anda yalın arxasından başqa bir atlı çıxdı. Ağ ürgə günəşdə par-par yanır, külək Elbilgənin saçlarını bayraq kimi dalğalandırırdı. Ancaq türklər qara bayraq sevməz... Bu xoş görüntü deyil.

Elbilgə qənşər gəldi:

- Ey, Qutluq bəy, ərlik eləmədin! Məni bir el qızına dəyişsən, yandırmazdı. Varıb dayılarımın, böyük qardaşımın qanına əli bulaşmış min dilli, min üzlü çinlilərdən birini gətirdin. Bəni öldürmək içın! Ancaq o da yaşaya bilməz. Ərənliyin çatsa, sancdığım oxu alıb bitirərdin onu, bacarmadın. Şimdi bəni vur! Onsuz da bir kərə vurulmuşam... Vur!..

Danışdıqca göz yaşları saçılırdı.

Qutluq qonuşmaq, indinin özündə də ona hər kəsdən yavuq olan, ilk sevgisini ovutmaq, əl atıb atının yüyənindən tutaraq, onu yanaşı saxlamaq istədi. Bunu duyan Elbilgə özü cilovu çəkdi. Ağ ürgə yana sıçrayıb şahə qalxdı. Elbilgə atını dolandırıb aralandı, dağın milindən geri döndü. Dönərkən sadaqdan ox alıb yayına qoydu.

- Böyüklərimizin qanını batıra bilməzsən, Qutluq bəy! Xanımından törəyən də çinli olacaq. Törəməsinə dözməm, - dedi. Bu sözlərlə yayı köksünə qaldırdı.

Ox vıyıltıyla uçdu, uçdu! Sakitcə, boşluqda üzürmüşcəsinə... Sanki qız istəsə onu yenidən yayına qaytara bilərdi. Qutluq əl uzatsa oxu ona yetişməmiş, göydə tutar, çöp təki qırıb atardı. Di gəl, ikisi də donub uçan oxa tamaşa edirdilər. Yaşadıqları ömür qədər yol keçdi

bu ox, uçdu, uçdu, çiçək sancılırmış kimi Qutluğun sinəsinə sancıldı. Deşib kürəyindən çıxdı. Elbilgə bundan sonrasını, Qutluğun bükülüb atın boynuna düşməsini, atın sanki düşünərək nəyisə götür-qoy edirmişcəsinə, yavaşca geri dönməsini gözləmədən ağ ürgənin yalına yatdı, ürgə onu uçuraraq çöllərin sonsuzluğunda itirdi.

* * *

At yükünü aşırmamaq üçün asta-asta ordaya döndü. Haraya çağırırmışcasına kişnədi. Qutluq sürüşüb yerə düşsə də, ayağı üzəngidən asılı qaldı. At yiyəsini incitməkdən qorxurmuş kimi donub qaldı. Görənlər qaçıb yetişdilər. Ordaya ün düşdü.

Qutluğu kimin vurduğunu anışdıra bilmirdilər. Görən atdı, o da tanıqlıq edə bilməzdi. Uslu Xocayla Ərdəm bir-birlərinə açmadan ikisi də bu gözlənilməz ölümün Elbilgədən uzaq olmadığı düşüncəsindəydilər. Ancaq açıb-ağartmadılar. Onsuz da Elbilgə bir tikə əppək olub, göyə çəkilmişdi. Bu işdə Çin qızının suçlu olduğunu hər kəs bilirdi. Hər gözdən oxunurdu bu. Bunu Li Şan da anlayırdı. Törəyə görə ölən kişinin uşaqları yetim, kimsəziz buraxılmaz, xanımınasa qardaşı yiyələnərdi. Qutluğun uşağı yoxdu, bir yandan da gəlinin ayağı ağır olmuşdu. Yapışmadılar. Yas qurtaran kimi Çinə gedən bir alış-veriş arğışına qoşuldu getdi. Ancaq ürəyinin altında Qutluğun kimsəyə bildirmədiyi üç aylıq cocuğunu da aparırdı. Yarım ildən sonra bir oğlu olacaqdı. İyirmi ildən sonra Qutluğun oğlu Çin ordusunda bölük başçısı kimi türklərin üstünə gələcəkdi.

## AZ ƏRLƏYRİYLƏ QOVUŞMAQ

Oğuz xan Günbatan yürüşünə gedəcəkdimi? Neçə il sonra? Bəlli deyildi. İç savaş ara vermirdi. Bir ocaq söndürülməmiş başqası yanırdı. Ancaq bu güzün bitib, qışın başladığı günlərdə elin günbatan yaxasından daha bir qara soraq gəldi. Əski qonşuları qamərlər başqa qonşularıyla birgə sözləşməni pozub, Itılı, Yayıkı aşaraq yeni qurulan Yengikəndədək gəlib çatmış, yurdları yağmalayıb geri dönmüşlər. Özlərindən sonra bir elçi də qoymuşlar.

Üzüörtülü elçinin gəlişi barış üçün gələnlərin gəlişinə bənzəmirdi. Qamər eligindən piti gətirmişdi. Buyuruqçu alıb oxudu. Qamər xaqanı yazırdı: "Ulu xaqan, sənin doğuda yağıları birər-birər əzib, diz çökdürməndən başımız göyə dirəndi. Yaradanın əli çiyninizdə, daşı əlinizdə. Kim bata bilər sizə? Biz qardaşıq!.. Eyni ataların törəmələriyik. Ellərimiz arasında uzun bağlılıq var. Günbatanda yağıların sizə gələn yollarını biz kəsmişik. Qutsal daşı daşımaq indi də bizə düşür. Yaradan onu Oğuz xan adına yox, türk adına göndərmişdir. Sanıram dörd yanımızda bunca yağı varkən, gücümüzü bir-birimizə

göstərməli deyilik. Daşı verməklə qardaş qırğınının qarşısını alarsan...”

Oğuz xan Yağmur daşının savaş üçün bir ilişik yeri olduğunu anladı. Yürüşlərinə ayrı bir don biçə bilməmişdilər. Türklərin Qara dəniz dedikləri Pont dənizinin quzey-doğu çevrəsi qamərlərindi. Gücləri, varları tükənməzdi. Boş yerdən üz tutub bura gəlməzdilər. Onu qorxutmaq istəyir, “daşı verməsən, savaşacağıq” deyirlər.

Qamərlərin bu gözlənilməz basqını Oğuz xanın günbatana yürüş istəyini alovlandırdı. Yürüş öncəsi gərəkən işlərin tapşırığı verilmişdi...

* * *

Tanrıçılar eldən-elə, ulusdan-ulusa dolaşıb qayıtdıqca Oğuz xanın dünyanı bir inanca tapınan, bir törəyə bağlanan, bir bayraq daşıyan tək bir ölkəyə çevirmək istəyi güclənirdi.

Bir yandan da Qam Atanın, babasının çağından sarayın baş gənəşçisi, ayıtçısı olmuş, qocalıb əldən düşsə də, düşüncəsinin kəsərini itirməmiş Ulu türkün, uşaqkən ona atabəylik etmiş Uslu Xocanın verdikləri bilgilərdən sonra onu çəkən Kaspi ötəsindəki birdilli, yavuq soylara, sonra da firounların Misirinə qədərki yerlərə ulaşmaq arzusundan qopa bilmirdi.

Bu uzun, dönüşü olub-olmayacağı bilinməyən yürüşə onunla birgə on minlərlə ev gedəcəkdi. Buna uyğun keçinəcək, araba, at-dəvə, yaraq-yasaq toparlanmalıydı.

Bu arada Issığın o üzündən çox ağır bir soraq gəldi. Oğuz xanın ən güvənikli qoldaşları, yoldaşları olan uyğurların gündoğanda qalmış bir qanadının karluklarla savaşı bitər-bitməz, bu dəfə güneydən tanqutların basqını başlamışdı. Qarşıda bir neçə ay vaxt vardı. Oğuz xan atları, dəvə ilxılarını, sürüləri yemləyib yola bəsləmək üçün İnci çayı sızrasına enəcəkdi. Arxada qalmış uyğyr elinə yardım eləmədən yürüşə çıxa bilməzdi. Qoşun başçılarından uyğur bəyi Dolmuşu beş min atlıyla Beşbalığa göndərdi.

İnci çayına enən yarğanların başında arxadan böyük bir köç yetişdi. Oğuz xanın günbatan yürüşünü eşidincə, ona qoşulmaq istəyən Az ərləri Göymən dağlarından qopub gəlmişdilər. Oğuz xan Az ərlərinin başçısı Alpan bəyi yanında oturdub ağırladı. Qoşun, qəbilə başçılarına ərmağanlar verdi. Yürüşün ikisinə də uğurlu olmasını dilədi.

Alpan bəy dedi:

- Bizim ulularımız Qazlıq deyilən buzlu dağlardan perikiblər. On beş, iyirmi doğuş öncə Quzeydən keçilməz dağları aşıb gələn, qarışqa sürüsü təkin sayı bilinməyən, bizim dildə danışmayan yırtıcı axın bizi yerimizdən qopardı. Yüz illərdi yurd deyibən qurd kimi ulaşır, yer üzünü ələk-vələk edərək dolaşır, ancaq içimizdəki acını qovub çıxara bilmirik. Tanrı səni bizim öcümüzü almağa göndərmiş. Bu böyük yolçuluqda sənə qoşuluruq. Harda sən, orada biz...

Oğuz xan üçün bu gözlənilməz, başını göyə dikən bir olaydı. Az ərlərini tanıyırdı, bilirdi. Dağınıq

yaşasalar da, ərdəmləri, boy-buxunları, görkləri, iti dilləriylə başqa boylardan seçilirdilər. Ancaq köklərinin Qazlıq dağlarının o üzünə bağlı olduğunu ilk kəs eşidirdi. Bu bilgi onun qarşıdakı yürüşünün doğruluğunun daha bir göstəricisiydi. İndi təkcə Qamərlərlə üzülüşüb-düzülüşməyə yox, eləcə də soydaşlarının əllərindən alınmış yurdlarını qaytarmağa gedirdi.

## ƏSKİ TARİXİN SONU

Hələ havalar isinməmiş, ilin beş ayı donan İnci irmağının buzu əriməmişdi. Bu, Oğuz xanın yolçuluğunu asanlaşdırırdı. Çay aşağı Aral gölünün bir neçə günlüyündəki yeni başkəndinə - Yengikəndə doğru endilər. İncinin sağından-solundan ərənlər axıb gəlirdi. Oğuz xan yaşlıların eldən qopmasını istəmirdi. “Biz yurdlarımızı atıb getmirik! Yeri bütövləşdirib, ulusumuzu onun bəyi qılmağa gedirik! Günçıxanın yaxa daşları ucaldılmışdır. Dönüşdə o daşları Kadırğan dağlarının o üzünə, Böyük dənizə daşıyacağıq. Günbatanda hamını el edib, qüdrətimizi artırıb dönəcəyik!” deyirdi.

İnci boyu əkin-biçin yerlərinə, badam, alma, heyva bağlarına, daşdan, torpaqdan tikilmiş obalara onurla baxırdı. Onun budununa yalnız akınçı, döyüşçü, heyvandar kimi baxanlar gözlərinə su versinlər. Türkün ordusu saldıranda, qorxuncdur, söz yox, aslanlar kimi saldırır. Ancaq yiyələndiyi elləri duyqusallıqla, tanrısal törələrlə yönəldir.

Yaz gəlincə çayın buz örtüyü lay-lay, parça-parça axıb Aral gölünə töküləcək. Ordan ta Termez civarlarınadək gəmilər üzür. Onun yurdunun gəmiləri!.. Alış-veriş qızışır. Xarəzmlilər Çindən vurub Ellindən

çıxırlar. Xarəzm demiş, Qaraqumla ağız-ağıza olan bu cənnət bucağını çox sevirdi. Aral dənizinin dörd yanı onun uluslarının gur yaşadığı yerlərdi. Burdan yüklənib Kaspinin quzeyindən aşacaqdılar.

İndiyədək heç bir axın onu bunca ilgiləndirməmişdi. Yol uzaqdı, ağırdı, sözsüz! Gedəcəyi ölkələr də qarışıqdı. Çin, Hind qədər qalabalıqdı. Yer üzünün bütün yollarının qovuşduğu, toqquşma, birləşib-ayrılma, qan-qada yerləriydi.

Karvanlarla illər uzunu gedib-qayıdan tanrıçılar könülsüz danışırdılar. İç-içə xırdaca ellərin inancları da qarışıqdı, barışmaz durumdaydı. Göy Tanrının inancının yayılmasına qarşı çıxanlar özlərini Yer Tanrısı sayırdılar. Doğuya baxmış günbatandakılar daha gələnəksəl, daha dirənişli, ruh aləminə daha çox bağlıydılar. Tanrıçıların Kaspinin o üzündə üzləşdikləri zorluqlar, çəkdikləri acılar Oğuz xanı tələsdirirdi. Onun bu ovqatı eli bürümüşdü.

Yollar boyu başlıca düşüncəsi, qayğısı akın yıryığışının bitirilməsinə yönəlmişdi. İyirmi gün sonra Xarəzmin baş kəndi Xivəyə yetişdi. Orda iki gün dincəlib quzeyə üz tutdu, İncini adladı, çadırlarını Yenigikəndin qapısı ağzında qurdu.

Küçələrində adam əlindən tərpənmək olmayan, bağ-bağçaları göz oxşayan, gur, gülərüz, qonaqcıl Xivədən sonra Yengikənd boz, yapışıqsız görünürdü...

Gecə ilə gündüzün bərabərləşdiyi gün Issıq gölə göndərilmiş qoşun çaparaq özünü yetirdi. Uyğur bəyi Dolmuş Oğuz xanın önündə diz yerə qoyub, bağır basdı.

Tanqut ordusu darmadağın edilmiş, uyğurların uzun sürəcək dincliyi qurulmuşdu. Ancaq elə bir iş də

baş vermişdi ki, savaşda yenilsələr, ondan yaxşı olardı. Yağı Ərkonun yolunu bulub, sızraya girmiş və mağaraları yağmalayıb, dağıdıb, bitikləri alıb getmişdilər.

Oğuz xan yerindən sıçradı. Qılıncın qəbzəsini sıxmaqdan əli damar-damar oldu. Amma bu uzaqlıqdan heç nə yapa bilməyəcəyini görüb taxta çökdü; əlləriylə başını tutdu:

- Bəs Ata Ünürdəki ağumuz, bəs bitiklər?

- Hər şeyi çalıblar.

- Bəs Qam Ata?

- Öldüsünü-qaldısını bilən yoxdur. Onu da tutuqlayıb aparıblar dedilər. Biri dedi yolda qurtulub, Fərqanə yoluyla günbatana doğru qaçıb. Başqası da ünürün içinə dalıb, göyə çəkilib deyirdi.

Oğuz xan özüylə danışırmış kimi "Qutsal daşın oğurlanması məni bu qədər yandırmamışdı. Zatən Ata Mağarada Tanrı damğası qorunurdu. O, bizə yetərliydi. Ancaq indi hər şey qeyb olub getdi. Yer oğlunu Tanrıya, Ulu Göylərə aparan yollar qapandı, keçmişimizin açarını itirdik. Bu elə başımızın açarını itirmək deməkdi. Tanrıya ulaşdıran dilimiz bağlandı. Hər şey bitdi. Yazıq turkə, yazıqlar bizə!" dedi.